**Mürtəzaqulu xan Şamlu. Divan. Bakı: Nurlan, 2006, 74 s.**

## MÜRTƏZAQULU XAN ŞAMLU ZƏFƏR VƏ ONUN DİVANI

Az tanınmış və adı ədəbiyyat tarixi kitablarımızda layiqli yerini tutmamış şairlərimizdən biri də Şah Səfi (1629-1642) və II Şah Abbasın (1642-1666) hakimiyyəti dövründə yüksək dövlət vəzifələrində işləmiş Mürtəzaqulu xan Zəfərdir. Azərbaycanda şair haqqında qısa məlumata doktor Cavad Heyətin «Azərbaycan ədəbiyyatına bir baxış» kitabında rast gəlmək olar. Yazıçı Anar çap etdirdiyi «Min beş yüz ilin oğuz şeiri» antologiyasının I kitabına Cavad Heyətin kitabından şair

haqqında məlumatı və onun bir şeirini daxil edib. Şairin həmin şeiri aşağıdakı bəndlə başlanır:

Üç bəlalı kimsə olmuş həmdəmim,
Gah hicran, gah hərman, gah məlal.
Gecə-gündüzdür ənisü məhrəmim,
Gah hicran, gah hərman, gah məlal.

Bu şeir II Şah Abbasın aşağıdakı bəndlə başlanan tərcibəndi-mürəbbesi ilə səsləşir:

Üç vəfalı kimsə olmuş həmdəmim,
Gah firqət, gah möhnət, gah qəm.
Gecə-gündüz qəm əmsü mərhəmim,
Gah firqət, gah möhnət, gah qəm.

Almaniyada yaşayan həmvətənimiz Məhəmmədəli Hüseyninin bizə göndərdiyi məlumatdan və professor İsmayıl Hikmət Ertaylanın 1965-ci ildə nəşr edilmiş «Divani-türkiyi-Zəfər» kitabından bəlli olur ki, Mürtəzaqulu xan Azərbaycan türkcəsində və farsca çoxsaylı şeirlər müəllifidir və onun ana dilimizdə divanı həmin dövr poeziyamız haqqında əlavə məlumatlar əldə etməyə imkan verir.

İsmayıl Hikmət adı çəkilən kitabına ön söz yazmış və buraya Zəfər divanının fotofakmilesini daxil etmişdir. Həmin əlyazma barədə alim belə bir məlumat verir: «Əsər Qasım adlı bir xəttatın 15 rəbiüləvvəl 955 hicridə (miladi tarixlə 1587-ci ilin 4 fevralı—P.K.) yazmış olduğu çox gözəl xətli və çox gözəl təzhibli bir Füzuli divanı və «Bəndü badə»si ilə eyni cild içindədir. Cildin üzərinə qızılla vurulmuş Əbdülməcid tuğrasından kitabın Yıldız kitabxanasından çıxmış olduğu anlaşılmaqdadır.

Başqa bir nüsxəsi mövcud olmadığına və tədqiqindən də anlaşılacağı kimi, müəllifin öz əl yazısı ilə yazılmış yeganə əsər olduğuna hökm edilə bilən bu çox qiymətli əsəri araşdırmamıza təqdim edən çox dəyərli dostumuz kitabçı Rauf Yelkenciyə candan təşəkürü bir irfan və vicdan borcu bilirik».

Orasını qeyd etmək istərdik ki, görkəmli türk alimi İ.Hikmət divanı əvvəldən axıra qədər diqqətlə oxumadığına görə, yazdığı çox dəyərli ön sözdə istər əsərin yazılma tarixinə, istərsə də müəllifin həyatına dair bəzi faktları nəzərdən qaçırmışdır. Tədqiqatçı M.Hüseyni isə divanın tamamlandığını göstərən maddeyi-tarix yazılmış beyti görə bilmişdir. Divanın sonunda gedən qəzəllərdən birində oxuyuruq:

Ramazan ayında bu nüsxə sərəncam oldu,
Əlfu fa keçmiş idi hicrdən, itmam oldu.

Əbcəd hesabına görə əlif hərfi 1000, fa isə 80 rəqəmini bildirir. Buradan məlum olur ki, divan hicri tarixlə 1080, miladi tarixlə isə 1669-cu ildə tamam olmuşdur. Divandakı qəzəllərdən birində Mürtəzaqulu xan deyir ki, yaşı səksənə çatmışdır:

Gəldi yetdi zəman səksənə yaş,
Xar oldu bədəndə xabi-fəraş.

Buna əsasən təxmini olsa da, şairin 1591-ci ildə doğulduğunu söyləmək olar. Orasını da qeyd etmək lazımdır ki, «ya Rəb» rədifli başqa bir qəzəlində Zəfər yaşının yetmiş dördə çatdığını göstərir:

Yetişdi ömür yetmiş dördə, gəldi mövsümi-piri,
Cəhanda görmədim heç kimsədən buyi-vəfa, ya Rəb.

Buradan belə bir nəticəyə gəlmək olar ki, Mürtəzaqulu xan özünün türk divanı üzərində ən azı altı il işləmişdir.

Şairin kimliyi barədə danışmazdan öncə onun Şah İsmayıl Xətai tərəfindən əsası qoyulan Azərbaycan Səfəvilər dövlətinin yaradımasında fəal iştirak etmiş Şamlu obasından olduğunu göstərmək lazımdır. İstər dövlətçilikdə, istərsə də şeir-sənət aləmində yadda qalan işlər görmüş şamlular barədə prof. İsmayıl Hikmət Ertaylan yazır: «İdarə və savaş kimi dövlət işlərində böyük müvəffəqiyyətlər qazanaraq, böyük mövqelərə sahib olmuş bu qəbilənin mənsubları Səfəviyyə tarixində önəmli adlarla qalmışlar. Siyasət tarixində özlərinə belə uca bir mövqe təmin edən qəbilə ərkanı sənət tarixində də eyni dərəcədə ad qazanmağı unutmamışlar».

Məhəmməd Tahir Nəsrabadinin məşhur təzkirəsinə əsaslanan İ.Hikmət dediklərinə nümunə olaraq Səfəvilər dövründə Herat hakimi olmuş Həsən xan Şamlunu nümunə gətirir. Alim məlumat verir ki, Həsən xan dövlət işlərində mahir olduğu qədər, ədəbiyyat və xətt sənətində də ustad olmuşdur: «Əvamiri-əşərə» adlı bir əsəri tərifə sığmaz bir dərəcədə gözəl və qiymətli bir nəstəliq xəttiylə və öz qələmiylə yazmışdır. Bu qiymətli əsər bu gün Münhenin Baviyera Dövlət Kitabxanası muzeyində bir mövqe və ehtiram işğal etməkdədir». Bundan başqa, Həsən xanın farsca şeirlər divanının mövcudluğu da göstərilir.

İ.Hikmət Həsən xanın oğlu Abbasqulu xanın da atası kimi nəstəliq xəttində ustad olduğunu (hər ikisi məşhur xəttat Mir İmad Qəzvininin şagirdi olmuşlar), əsərlərinin Baviyera Dövlət Kitaxanası muzeyində saxlandığını məlumat verir.

Görkəmli ədəbiyyatşünas-alim Salman Mümtaz XVII əsrdə yaşamış, Şamlu obasından olan, «Səfi» təxəllüsü ilə türkcə və farsca şeirlər yazan Azərbaycan şairi haqqında «Ma-

arif və mədəniyyət» jurnalında (1925, №1) kiçik bir məqalə yazmışdır. Alim şair barədə yazır: «XI əsri-hicrinin son yarısında ədəbiyyatımızı çiçəkləndirərək doğma ana dilimizi genişləndirən mövzun təbli şairlərimizin biri də Səfidir. Səfi parlaq bir haleyi-qudsiyyətlə məhat olan Şeyx Səfiəddin Ərdəbili xanədanına maddi və mənəvi rabitələr ilə mərbut olan Şamlu Zülfüqar xanın oğludur. Adı Səfiqulu, təxəllüsü də adından məxuz olan «Səfi»dir». «Ruzi-rövşən», «Qisəsül-xaqan» və «Xəzaneyi-amirə» təzkirələrinə istinad edən S.Mümtaz Səfiqulu xanın Qəndəhar hakimi olduğunu, h.1070-ci ildə (1660) Məşhədə, h.1088-ci ildə (1677) Herata bəylərbəyi təyin edildiyini söyləir. Alim Səfiqulu xanın doğma dilinə və mədəniyyətinə hər zaman sədaqətli olduğu, yaradıcılığının özündən sonra gələn sənətkarlara təsir etdiyi barədə belə yazır: «Səfiqulu xan fars məmləkəti və fars milləti içində yaşarkən öz doğma ana dilini unutmamış və azərbycanca şeirlər söyləmişdir. Kəlamında əmsal və iqrarına görə nazik mənalar, incə fikirlər və bakir mövzular işlətməyə səy etmişdir…

Səfiqulu xanın ədəbiyyatınmızda olduğu kimi, musiqimizdə də özünəməxsus mövqeyi vardır. Musiqidən xəbərdar və o aləmə dara və zəkavətli bir zat imiş. Səfəviyyə dövlətinin son hökmdarı olan Sultan Hüseynin əhdində milli musiqimizə dair yazılan daha mühüm bir əsərdə onun türkcə təsnifləri vardır ki, sözlərini özü söyləmiş və özü də bəstələmişdir. Şeirlərinin də bəzisi şairlərimizə, xüsusən Seyid Əbülqasim Nəbatiyə qüvvətli təsiri olmuşdur».

Mürtəzaqulu xan Şamlu Zəfərin istər yaşadığı dövr, istərsə də şəxsi keyfiyyətləri, vətənpərvirliyi, bəzi yaradıcılıq xüsusiyyətləri etibarı ilə Səfiqulu xan Şamluya yaxın cəhətləri

vardır. Onu da qeyd etmək istərdik ki, Zəfərin divanında onun tərcümeyi-halına aid daha bir faktı da aşkar edə bildik:

Zəfərin qəzəllərindən birinin son beytindən məlum olur ki, o Şah Səfi və II Şah Abbasdan sonra Səfəvi hökmdarı olmuş Şah Süleymanı (hakimiyyəti illəri: 1666-1694) taxta çıxması münasibəti ilə təbrik etmişdir:

Şükr kim, açdı qapı yüzimizə fəthü Zəfər,
Təxt üstinə bu gün yengi Süleyman gəldi.

Orasını da qeyd etmək istərdik ki, XVII əsrdə yaşamış görkəmli Azərbaycan şairi Qövsi Təbrizi də dövrünün tanınmış siyasi xadimi və şair Uğurlu xan Ziyadoğlu Müsahibə həsr etdiyi tərci-bəndində Süleyman şahın adını çəkibdir:

Uğurlu xan Ziyad oğlu Müsahib ruzigarında
Ki, biz onun qulu, ol bəndeyi-Sultan Süleymandır.

Səfiqulu xan Şamlu kimi Mürtəzaqulu xan Şamlu da yüksək dövlət vəzifələrində çalışmış, farsca çoxsaylı şeirlər müəllifi olduğu halda, ana dilini də unutmayaraq türkcə şeirlər yazmışdır. Şairin müasiri Məhəmməd Tahir Nəsrabadi öz təzkirəsində məlumat verir ki, Mürtəzaqulu xan Şah Səfi zamanında İrəvana yürüş vaxtı göstərdiyi cəsurluğa görə əvvəlcə eşikağasıbaşı, sonra divanbəyi vəzifəsinə təyin edilmişdi. Şah Abbas II zamanında qoçubaşı, Kerman vilayəti valilisi vəzifəsinə yüksəldilmişdi. Qəzvindəki hərbi əməliyyatlar zamanı xoşagəlməz bir hərəkət düşmənləri tərəfindən onun adına çıxıldığına görə, Mürtəzaqulu xan vəzifəsindən azad edilmiş, bir müddət guşənişin həyat keçirmişdir. Şair taleyin sərt zərbəsindən şikayət emir, səbrlə ədalətin bərpa olunacağını gözləyir. Bir müddət sonra onun günahsız olduğu məlum olur və Şah Abbas II onu Şeyx Səfiəddin türbəsinə mütəvəlli (başçı,

nəzarətçi) və Ərbədil vəziri təyin edir. Nəsrabadinin dediyinə görə, o təzkirəsini yazan zaman Mürtəzaqulu xan həmin vəzifəni icra edirdi. Bu, o dövr üçün çox böyük vəzifə idi, çünki Şah İsmayıl Xətainin, bütün Səfəvi hökmdarlarının ulu babası olan Şeyx Səfiəddin Səfəviyyə təriqətinin banisi və əsas ideoloqu idi. Orasını da qeyd etmək lazımdır ki, türkcə divanının dibaçəsində şair özünü mütəvəlli kimi təqdim edir. Dibaçədə şair ahıl yaşlarında Azərbaycan türkcəsində divan tərtib etməsinin səbəbini izah edir: «…çün səfheyi-ruzigarda yadigar qalmaq üçün xatirə yetişdi ki, farsi əşarı qərib yüz bin beytə yetişmiş idi, bir neçə türki gövtarı inşa oluna». Buradan belə bir nəticəyə gəlmək olar ki, yüz min beytə yaxın farsca şeiri olan (Nəsrabadi təzkirəsində onun farsca dörd min beyti olduğunu söyləyir) qocaman şair yaşının ixtiyar çağında vətən sevgisi, ana dilinə ehtiram nümayiş etdirərək türkcə divan tərtib etmişdir.

Orasını da qeyd etmək istərdik ki, ədəbiyyatşünas Məhəmmədəli Hüseyninin köməyi ilə Zəfərin ədəbi irsinə aid daha bir əsəri, şairin 1994-cü ildə aşkar edilmiş çüngünün çapdan çıxmış bir nüsxəsini əldə etmişik. Azərbaycan, fars və qismən də ərəb dilində yazılmış bu məcmuə «Cünge-Mürtəzaqulu xan Samlu» adı ilə 2004-cü ildə Tehranda nəşr edilib. 650 səhifədən ibarət olan bu cüngün tərtibatına II Şah Abbas dövründən, 1658-ci ildən Mürtəzaqulu xanın rəhbərliyi ilə başlanıb. Buraya Zəfərin Azərbaycan türkcəsində, farsca yazdığı şeirlər, onun Həzrət Əlinin şeirlərindən farscaya etdiyi tərcümələr də daxil edilib. Şairin cüngdəki türkcə şeirlərinə divanında da rast gəlirik. Ön sözdə verilən məlumata görə, bu

qiymətli əlyazmanı vaxtı ilə təbrizli Əsədulla Naziməddövlə İstanbulda İran səfiri olduğu zaman, 1892-ci ildə almışdır.

İsmayıl Hikmət şairin türkcə divanı əsasında onun yaradıcılq xüsusiyyətlərini belə xarakterizə edir: «Türkcə divanının tədqiqindən qüvvətli bir şair və nasir olduğu görülən Mürtəzaqulu xan Zəfər ən çox qiymət verdiyi şair olan Füzulini, Şah İsmayılı örnək almaqda və inanc olaraq da Şeyx Səfiəddin Ərdəbilinin təriqətini mənimsəməkdədir. Bunda da onun Ərdəbildə mütəvəlli olmasının təsiri böyükdür. Eynən Füzulinin Kərbəlada İmam Hüseyn türbəsində çırağsuz (çıraqyandıran-P.K.) olmasının təsiri altında qalmış olduğu kimi…»

Şeirlərindən Mürtəzaqulu xanın şiəliyə, qızılbaşlığa, Şeyx Səfi dərgahına sadiq bir şəxs olduğunu görürük. Onun «Tövbənamə»sinin sonunda oxuyuruq:

Həm bihəqqi-Əliyi-vəliyyi-cəhan,
On bir oğludurur imami-zəman.
Xətmdir Mehdi on birinə təmam,
Sələvat ona ver, könül, və səlam.

Zəfər şeirlərində dəfələrlə Həzrəti-Əliyə böyük məhəbbətini izhar etmişdir:

İmami-cümlə insü can Əli ibni-Əbi Talib,
Könül mülkindədir sultan Əli ibni-Əbi Talib.
Rəvadır hökmi can içrə, çü cani-ruh rəvan içrə,
Gəzər kövnü məkan içrə Əli ibni-Əbi Talib…
Zəfər quldur ona candan, keçibdir xan ilə mandan,
Ayırma axır imandan Əli ibni-Əbi Talib.

Zəfərin qəzəllərində onun Şeyx Səfi dəgahına çox sadiq bir adam olduğunu görürürk:

Ey Zəfər, istər isən dövləti-baqi tapmaq,

Şeyx Səfi dərgəhindən dərgəh tutma ariz.

Türkcə şeirlərində Mürtəzaqulu xan Zəfərin ən çox böyük Füzulidən təsirləndiyini görürük. Ümumiyyətlə, XVII əsrdə türkcə yazıb-yaradan Azərbaycan şairlərinin, demək olar ki, hamısının yaradıcılığında Füzuli təsirini görə bilərik. Saib Təbrizi, Qövsi Təbrizi, Məlik bəy Ovci, Mirzə Saleh Təbrizi, Vəhid Qəzvini, Təsir Təbrizi və s. sənətkarlar ana dilində yazdıqları şeirlərində Füzuli ənənələrinə sadiq qalır, onun qəzəllərinə nəzirələr yazır, böyük şairin ədəbi məktəbini davam etdirirdilər. Zəfərin şeirlərinin ahəngində, ifadələrində, sözlərində Füzuli təsirini görməmək mümkün deyil:

Ya Rəb, müdam inayətin et püşüva mənə,
Zövqi-visalın eyləginən aşina mənə.
Könlüm evində səndən əgər qeyr var isə,
Qəhrinlə eyləgil sən o fikri bəla mənə.

Gecə-gündüz Füzulini mütaliə edən Zəfər elə bil ki, dünyaya ustadının gözləri ilə baxır və özündən asılı olmayaraq şeirlərinin çoxunu fuzuliyanə yazır:

Can nəqdini fəda rəhi-canənə qılmışam,
Könlüm evini eşq ilə viranə qılmışam.
Məcnundan artı şöhrəti-eşqim bu xəlq ara,
Fərzanəyəm ki, özümi divanə qılmışam.

Şair Füzulini özünə ustad seçdiyini hamıya belə elan edir:

Ey Zəfər, tutgil qulaq bir dəm Füzuli şeirinə,
Ondan özgə bir şair şeir deməz, bu nemət.

Dahi şairimizin elə şeiri var ki, Mürtəzaqulu xan onun təsiri ilə bir neçə şeir yazıb. Məsələn, Füzulinin

Bəhri-eşqə düşdün, ey dil, zövqi-dünyani unut,

Balığ oldun, gəl rəhimdən içdiyin qanı unut—beyti ilə başlanan qəzəlinə Zəfər

Eşqə düşdün, ey Zəfər, gəl rahəti-cani unut,

Yetmədin bəzmi-vüsalə, hicri-canani unut—

beyti ilə başlanan nəzirə yazmışdır. Bundan başqa, şair Füzulinin həmin şeirinin təsiri ilə formaca fərqlənən, lakin məzmunca yaxın olan

Ey könül, çün eşqə düşdün, keç bu dəhri-fanidən,

Algilən bir busə yarın püsteyi-xəndanidən—

beyti ilə başlanan qəzəl də yazıbdır.

İsmayıl Hikmət şairin yaradıcılığının Füzuliyə yaxın və ondan fərqli olan cəhətləri barədə yazır: «Kəlmələri, tərkibləri, təsəvvür və təsvirləri, həyəcan və hicranları tamamilə füzuliyanə deyilmidir? Aradabir gözə çarpan və könülə xitab edən fərqlər onun keçirdiyi həyatla Füzulinin keçirdiyi həyat arasındakı fərqlə bağlı idi. Füzuli bir türbədə çıraqsuz idi, Zəfər isə qurduğu şahanə məclislərdə çıraq əfruzdu…

Mürtəzaqulu xan dərü divan sahibi bir sultandır. Qapısında qulları, gözü önündə məqbulləri və mədhuləri vardır. Onun füzuliyanə fəryadü fəğanları Füzulininikilər qədər içdən və yaşayışdan gəlmə deyildir. Gül üzlü nigarına «gətir piyaləni, gərdişə sal!»—deyən dövlətmənd ilə gündə zəvaiddən doqquz ağça ala bilmək üçün dünyanın əzabına qatlanan zavallı Füzulini yaşayış baxımından müqayisə etmək necə mümkün olar?»

Zəfərin şeirlərində Şah İsmayil Xətainin də təsirini görə bilərik. Onun aşağıdakı misraları Şah İsmayılın «Dəhnamə» poemasının əvvəlini xatırladır:

Bildimi, könül ki, yar gəldi,

Qış getdivü laləzar gəldi.
Bülbül oxur idi bu səbəqdə
Kim, fəsli-gülü bahar gəldi.

Şair şeirlərinin birində Xətainin adını çəkir:

Ey Zəfər, bu göftgu sultan Xətai sözüdür,
Keçmə namərd körpüsündən,  qoy aparsın su səni.

Şeirlərində Zəfərin çox səmimi bir şair olduğunu, tərcüme-yi-halının məqamlarını cəsarətlə, şüurlu surətdə əsərlərinə köçürdüyünü, XVII əsr poeziyamızda özünəməxsus yerə malik olduğunu görürük. Onun bəzi qəzəlləri süjetli lirik şeirin gözəl nümunələridir. Zəfərin

Bu gecə dilbər məni evində mehman eylədi,
Əl tutub mənimlə yengi əhdü peyman eylədi—

beyti ilə başlanan qəzəli Nizami Gəncəvinin «Gecə xəlvətcə bizə sevgili yar gəlmiş idi»— misrası ilə başlanan şeirini xatırladır.

Dediyimiz kimi, şair türkcə divanının tərtibinə ən azı 74 yaşında başlamış, 80 yaşında tamamlamışdır. Çox yaşamış, həyatda çox şeylər görmüş, döyüşlərdə şücaət göstərmiş, yüksək vəzifələrə ucalmış, taleyin sərt zərbəsinə məruz qalmış, intriqalar nəticəsində vəzifədən uzaqlaşdırılaraq güşənişin həyat sürmüş, günahsızlığı sübut edildikdən sonra yenidən yüksək vəzifəyə təyin edilmiş qocaman şair ixtiyar yaşlarında ana dilində tərtib etdiyi divanında nələrdən yazır? Zəfərin şeirlərində başına gələn bir çox əhvalatalar, zəngin həyat təcrübəsi, həyata münasibəti, oxucusuna çatdırmaq istədiyi nəsihətamiz fikirləri əksini tapmışdır. Bu məqamlarda o əlbəttə ki, realist sənətkardır. Qəzəllərindən birini şair həyatın ona vurduğu zərbələrindən şikayət notları ilə başlayır:

Bir nəfəs dövri-fələkdən xatirim şad olmadı,
Qəm əlindən xəstə könlüm bir dəm azad olmadı…
Gah işrət yerinə yetişdi tir ilən tüfəng,
Heç kimə mənim kimi bu qism bidad olmadı.

Həyatın keşməkeşlərindən şikayət edən Zəfər qəzəlini nikbin əhvali-ruhiyyədə bitirir, dünya görmüş qocaman şair deyir ki, hər qəmin, iztirabın sonunda şadlıq var. Onun həyat təcrübəsi bunu sübut edir:

Ey Zəfər, şad ol ki, bir möhnətin yüz əcri var,
Kim ki, qəm çəkdi bu gün, olmaz ki, dilşad olmadı.

Şair yazdığı tərkibbəndə taleyi tez-tez rəngini dəyişdirən heyvana-buqələmuna bənzədir, oxucunu həyatın çətin məqamlarında ruhdan düşməməyə çağırır:

Düşübdü gərçi mənimlə bu çərxi-buqələmun,
Zəfər tapıb eylədi bəxt rayətini nigun,
Könül cəfayə dözüb vəz′in etdi digərgun,
Yenə vəfayə dönüb eylədi bəsi gərdun,
Budur həmişə onun işi, olmagil məhzun.

Zəfər 74 yaşda olduğunu dediyi «Ya Rəb» rədifli qəzəlində də əvvəlcə vəzifədən çıxarıldığını, bir küncə çəkildiyini söyləyir, sonra isə düşmənlərini cəzasına çatdırdığına görə Yaradanına şükr edir:

Cəhanda sox hökumət eylədim, gördüm vəfası yox,
Çəkildim küncə, lütfün kəsməgil ta müntəha, ya Rəb.
Yetişdi ömr yetmiş dördə, gəldi mövsümi-piri,
Cəhanda görmədim heç kimsədən buyi-vəfa, ya Rəb.
Zəfər verdin mənə, düşmənlərimi xarü zar etdin,
Behəmdullah ki, səndən görmədim bir kəz cəfa, ya Rəb.

«Ya Rəb» rədifli başqa bir qəzəlində şair dünyadan usandığını, birküncə çəkilib sakitcə qocalıq illərini yaşamaq istədiyini bildirir:

Hökumət eylədim çox, bu cəhan mülkindən usandım,
Mənə künci-qənaət mənzili dar eyləmə, ya Rəb.

Zəfər özünün həyat yoluna ibrət götürmək nöqteyi-nəzərindən baxır və bunu oxucunun nəzərinə çatdırır. O belə hesab edir ki, yaşadığı həyat, getdiyi yol doğru olmuşdur:

Həzar şükr kim, doğru yol üstədir səfərim,
Bu yoldan özgə əgər var, getmədim, batil.

Hədislər və Quran ayələri ilə yoldaşlıq edən qocaman şair özünü Həzrəti-Əlinin qulu hesab etmişdir:

Hədisü ayeyi-Quran kimi rəfiqim var,
Bu söhbət ilə cəhan içrə olmuşam kahil.
Zəfərlə yar olub, Mürtəza Əli quluyam,
Göz açıban yumicək ondan olmadım qafil.

Zəfər şeirlərində şükr etməyi heç vaxt yadından çıxarmır, Yaradana üz tutaraq «Behəmdullah ki, səndən görmədim bir kəz cəfa» deyir.

Şeirlərində Mürtəzaqulu xanın türk-oğuz folkloru, etnoqrafiyası ilə bağlı olduğunu da görürük. Bir qəzəlində dərdli, qəmli məqamı təsvir edərkən Zəfər «Kitabi-Dədə Qorqud» dastanlarında olduğu kimi göy və qara rəngə bürünməkdən danışır:

Yasəmənlər cümləsi batmış gög ilən qarəyə,
Ta ki, ol əgninə geymiş bir qəbayi-gülpəri.

Məlum olduğu kimi, «Kitabi-Dədə Qorqud»da Uruz atası Qazan xana üz tutaraq deyir: «Anam mənim üçün gög geyüb qara sarınsun, Qalın oğuz elində yasım tutsun».

Şairin şeirlərində orta əsrlər özbək ədəbi dilinin—cığatay-canın elementləri də müşahidə olunur ki, bunu da böyük özbək şairi Əlişir Nəvainin poeziyamıza təsiri kimi izah etmək lazımdır. İsmin yönlük halı bir çox yerlərdə –a, -ə, -ya, -yə kimi getdiyi halda, bəzi yerlərdə çığatay dilində olduğu kimi, -ğə şəklində (gülğə, zarımğa) gedir. İsmin çıxışlıq hal şəkilçiləri bəzi yerlərdə –dan, -dən əvəzinə –din şəklindədir. Məs.:

Qanlı çeşmim suyidin oldu Zərəfşan kağız.

Mürtəzaqulu xan Zəfərin həcmcə çox da böyük olmayan—cəmi 839 beytdən ibarət türkcə divanınıda şeirlərin ardıcıllığı əlyazmada olduğu kimi saxlanılmışdır.

Əlimizə çatmış fotovaksimilenin keyfiyyəti haşiyədə yazılmış, hərəsi altı beytdən ibarət iki qəzəli (onlardan biri «Könül quşunu qeyb etdi, Zəfər, bir dilbəri-tərsa», digəri «Ey könül, saldın kəməndə bir xubru» misrası ilə başlanır) tam oxumağa imkan vermədi. Eləcə də oxunmamış bir neçə sözün yerinə nöqtələr qoyulmuşdur.

Oxuculara təqdim edilən Zəfər divanı dibaçə, 114 qəzəl, 3 kiçik həcmli məsnəvi, 3 tərkibbənd, 2 tərcibənd, 1 müxəmməs, 1 müstəzad, 5 qitə, 1 rübaidən ibarətdir. Məsnəvilərdən biri tövbənamə mövzusunda yazılmışdır. Tərkibbəndlərdən biri eyni zamanda müsəddəs (müsəddəs-tərkib), digəri müxəmməsdir (müxəmməs-tərkib). Mürəbbe şəklində yazılmış bir tərcibənd xalq şeirimizin formalarından olan qoşmanı xatırladır.

Mürtəcaqulu xan Şamlu Zəfərin yeni çap edilən divanı bir daha göstərir ki, ədəbiyyat tariximizin hələ çox səhifələri üzə çıxarılmayıb, tədqiqatdan kənarda qalıb. İnanırıq ki, bu divan ədəbiyyat və dil tarixmizlə məşğul olan mütəxəssislər, o

cümlədən klassik ədəbiyyat həvəskarları tərəfindən maraqla qarşılanacaqdır.

**PAŞA KƏRİMOV,**
**filologiya elmləri namizədi**

## Bismillahir-rəhmanir-rəhim

Şükrü sipasi-namütənahi ol qadiri-biçunə kim, çün ədəmi-asayişgahidin vucudi-arayişi agahlərinə cilvə verib insanı sair məxluqatdin bərgüzidə edib nitqi-şərifinə mümtaz qıldı. Bu rübai məzmunilə

## RÜBAİ

Ol kim, bu cəhan xilqətin ağaz etdi,
Sün′ini kilklə nəqşpərdaz etdi.
İnsanı qamu nitq ilə mümtaz etdi,
Nitq əhlini nəzm ilə sərəfraz etdi.

Bihəddü qiyas ol saneə kim, çün ibarət… qıldən sonra ol gülşəni-irəm ayini nəzm əhlinin xameyi-rəşki-nigarxaneyi-çin qılub və qeyrət xüldi-bərin «Ya sədi cəllət ələuhu va ammət nəməuhu la ilahə ğeyrihi»[1] və dürudi-namədud ol ənbiya həlqəsinin xatəminə kim, «İnnə-ş-şeir hikmətun va innəl bəyənə sihrun»[2] nüktəsi ilə şüəra payəsin hükəma mərtəbəsinə yetürdi. «Səlləllahu əleyhi və alihi və səlləm və sələmun və salavatun və əkməl təhiyyət».[3] Onun vəsisinin pak rəvanına ki, məsduqə «Əntə minni bimənziləti Mərvan bin

---

[1] Ей иттифагы бюйцк, немятляри щяр бир йана йайылмыш аьам! Ондан башга илащя йохдур.
[2] Шеир щикмятдир, бяйан ися сещрдир.
[3] Аллащын Она вя Онун аилясиня хейир-дуасы вя онлара хейир-дуа вя ян мцкяммял саламлары олсун.

Musa, illə ənnəhu lə nəbiyyə budi»[4] ki, imam pişvayi-külli-məxluqatdır «Əleyhis-səlat vəs-səlam»[5]. Əmma bəd. Nazimi-lüali hüləl və huli Mürtəzaqulu mütəvəlli bu tərz ilə bəyani-hal və bu nəhcilə «Şəraha mafil-bal»[1] edər ki, çün səfheyi-ruzigarda yadigar qalmaq üçün xatirə yetişdi ki, farsi əşari qərib yüz bin beytə yetişmiş idi, bir neçə türki göftarı inşa oluna.

Həvayi-ruhəfzayi-bustan şövqə düşüb bülbüli-şuridəhal kimi məsd olub bir neçə qəzəli-şikəstə bəstə nəzmə çəkib bu nadirə məcmuəyə dərc oldu. Rəhməti-əzəli ol paknihad yoldaşlara ki, bu novərusi-şahidə müşahidə qıldıqca əlasinin hilyəsinə təhsin ilə cəmali-kəmalinə zinət yetürə və ədnasının şaninə mürüvvət birlə zülfi-xətasından üqdeyi-üyubin çıxarıb ayineyi-qüdrətindən seyqəli-ehsan ilə nöqsan ğübarin götürə.

### HÜVƏL-MƏSNƏVİ

Kərim ki, yoxdur bidayət ona,
Həkim ki, yoxdur nəhayət ona.
Edər zərrəni lütfü-tabində benur,
Kərimi-xandin bəhrəbər marü mur.
Gədayi gəhi padşah eyləyən,
Gəhi padşahı gəda eyləyən.
Odur baisi-nüsrət ilən zəfər,

[4] Сян мяним нязяримдя Мярван бин Муса дяряъясиндясян. Йалныз о (Муса) мянимля ян йахын мясафядя олмуш пейьямбярдир.
[5] Она хейир-дуа вя салам олсун.

[1] Аьыла эяляни шярщ етди.

Səfərdə əgər olsa, yaxud həzər.
Odur cümlə biçarələr yavəri,
Odur xeyli-avarələr rəhbəri.
Sıqışmaz təng zərfə zatı onun,
Cəhanı tutubdur sifatı onun.
Ona kim edər himməti yarlıq,
Verür istədügündən avarlıq.
Əgər neçə gün dəhrara zar edər,
Dönüb düşmənin xəlqara xar edər.
Təvəkkül evin qıl Zəfər caygah,
Apargil onun sayəsinə pənah.
Xuda həmdidin, sonra yüzmin qıl dürud,
Nəbiyyü vəli nətdə qıl sürud.
Əleyhəssələvatü əleyhəssəlam,
Həm alü həm itrətinə bərdəvam.
Təmam oldu çün həmdü nətü səna,
Günahumə qalma bənüm, rəbbəna.
Şüru eylədim şeir izharına,
Çü qoydum qədəm eşq gülzarına.

## QİTƏ

Məhəmməd Ərəbi şanı ondan artıqdır
Ki, qeyr millət əgər olmaya ona qail.
Günəş kimi bu cəhanı tutubdur ənvarı,
Həqir zərrə nədir kim, ola ona hail.
Onun yolunda fəna mütləq olmayan nə bilir
Ki, oldur səbəbi külli-afəriniş gil.

* * *

Yarəb, ey çarəsazü hadiyi-rah,
Tövbə çox eylədimü pozdu günah.
Çəkdim əl cami-badə içməkdən,
Xatirim oldu xoş bu keçməkdən.
Keyf ilən gərm oldu bazarım,
Zahirən əksük oldu azarım.
Bənd xatirdə artırır vəsvas,
Gevizü əfyunə rağib olsa həvas.
Birisi gərmü biri yabisdir,
Gərm olan təbi xüşk edər bəsdir.
Etidal ilə olsa gər hər iş,
Yəman olmaz, səfa verür kəmü biş.
Ey könül, güli flüniya yeyəlim,
Əginə pakizə şalü sədəf geyəlim.
Bəzmimiz gül tək olsun arayış,
Gəldi yeni baharü getdi qış.
. . . iyləmiş gülün xiridarı,
Gərm edibdir gül ilə bazarı.
Saqiya, sən də eylə eyş müdam,
Mənə vəhdət meyini ver bir cam.
Kim könül güzgüsün edə rövşən,
Yüzümüzə gülə gülü gülşən.
Bu cəhan mülkünün vəfası yox,
Mehri azdır onun, cəfası çox.
Barilaha, bu tövbəm eylə qəbul,
Behəqqi-abruyi-ali-rəsul.
Həm behəqqi- Əliyyi-vəliyyi-cəhan,

On bir oğlıdurur imami-zəman.
Xətmdir Mehdi on birinə təmam.
Sələvat ona ver, könül, və səlam.

* * *

Əvvəl Allah adını, ey aqil,
Oxuyub eşinqə olgilən kamil.
Künci-üzlətdə padşalıq et,
Dərgəhi-həqqə var, gədalıq et!
Ey könül, çünki düşdü başına iş,
Fikrini eyləməgil, demə kəmü biş.
Ol edir cümlə kainatə nəsəq,
Ol salur canü başə nəşeyi-həqq.
Kərəmidür onun müfərrəhi-can.
İzzət ondan bulubdur əhli-cəhan.
Əql ilən gərm eylə bazari,
Cəhanın çoxdurur xiridari.
Özüni tapşır ona leylü nəhar,
Vasil ol dərgəhinə, ey biar.
Gərçi, yoxdu evini cami-qürur,
Qəm yemə, aqibət edər məmur.
Gümlə işlərdə oldurur müdrik,
Maərəfnakə həqqə mərifətikə.
Zatının nəşəsindən aləm məst,
Sifəti bəzm içrə badəpərəst.
Hər kim etdi qürur camin nuş,
Axirüləmr oyanur mədhuş.
Zəfər ondan tapar zəlilü həqir,

Bəndəlikdə gər etməyə təqsir.
Gəldi  yetdi zəman səksənə yaş,
Xar oldu bədəndə xabi-fəraş.
Baş ağardıvü gözdə qalmadı nur,
Qəflət yuxusu eylədi məni kur.
Gözün aç, baxginən ki, yetdi əcəl,
Yoxdurur bəndəlikdə cücə əməl.
Cümlə taətləri riyai imiş,
Bilmədin əsli can fədai imiş.
İmdi kim, qoca, dün verürsən can,
Olmaya bir qabili-qurban.

Bismillahir-rəhmanir-rəhim,
Fəthü zəfər bəndəyə verdi müqim.

İsmi-Allah ilə sözü çün etdüm ibtida,
Həqqin inayəti yetirə ta be intəha.
Bir kimsəyə səna qılıram kim, zəvalı yox,
Hər ismi-əziminə ola canü dil fəda.
Ol bir kərimdür ki, xəlayiqə can verüb,
Musanın əl əsasını ol etdi əjdəha.
Ta əmr qıldı aləmə şər′i-Məhəmmədi,
Göndərdi Cəbrail ilə Yasınü Tavu Ha.
Bir «kün» sözü ilə çü yaratdı çün aləmi,
Ad etdi axirət evinə mənzili-bəqa.
Ey Mürtəza, bu dövri-fənanın vəfası yox,
Əqlin var isə, aç gözünü, istəgil bəqa.
Cəhd eyləgil ki, özünü qurtar bu vərtədən,
Sən kimsən ki, ərz edəsən ona müddəa.

* * *

Ya Rəb, müdam inayətin et pişüva mənə,
Zövqi-vüsalın eyləginən aşina mənə.
Könlün evində səndən əgər qeyr var isə,
Qəhrinlə eyləgil sən o fikri bəla mənə.
Yüz dərd əgər bu dövri-fənadə çəkər könül,
Bir əbri-rəhmətin yetirir min dəva mənə.
Qəmdən bu xəstə canım olubdur bəla evi,
Vergil xəzaneyi-kərəmindən şəfa mənə.
Dərgahına bu bəndədə şayəstə yox əməl,
Aləmlər neçə lütfünü gördün rəva mənə.
Yolunda sabit eylə mənim etiqadımı,
Şol yolda Mürtəzanı eylə pişva mənə.
Etmə zəif canımı duzəx şərarəsi,
Nuri-ədalət ilə yetirgil səfa mənə.

* * *

Şükr eylərəm ki, yar olubdur zəfər mənə.
Yetməz hər əhli-cürmü xətadən xətər mənə.
Məstəm müdam saqiyi-kövsər əyağidən,
Bəsdir cəhanda nəşeyi-ahi-səhər mənə.
Baş əgmənəm bu dəhri-fənanın həvasinə,
Ta yetdi feyzi-şübhi-bəqadən xəbər mənə.
Bir danə limu ilə məzacım yerindədir,
Sevda nədir ki, artıra səfra şəkər mənə.
Çoxlar mənimlə qıldı mübahilə dəhrdə,

Sındırdı çərx boynunu, əgdi kəmər mənə.
Hər kim nə əksə töxm, həm ol əkdügin biçər,
Mən əkdügin nihal veribdür səmər mənə.
Bir zərrəyəm ki, pərvərişim gün şüaidir,
Həhs əğrəbin nühusəti etməz əsər mənə.

* * *

Qədi ol sərvi-rənanın könül hökminədir tuğra,
Rəvadır hökmi can içrə, özidir şuxi-bipərva.
Çəkilmiş qaşları yayı, həzər qıl, ey könül, ondan
Ki, iki gözünün mərdümlərilə eylədin qovğa.
Olur xəm qaməti-sərvi-səhi bidmula tək,
Əgər meyl eyləsə gülşən ara ol qaməti-rəna.
Gözəllər içrə misli yoxdur ol məhbub məhruyinin,
Yaratmış qüdrətilə xaliqi-bimislü bihəmta.
Zəfər müjganının peykanına canın nişan qıldı,
Bəlayi-eşqə düşdü, verdi canın, olmadı rüsva.

* * *

Əlif qəddin görüb hərf içrə düşdü başə bir sevda,
Bey ayrıldı əlifdən, düşdü bu xəlq içrə min qovğa.
Məcazi eşqə düşdü bu təni-zarım, əlacım yox,
Əlimdən ixtiyarım aldı bir məhpareyi-tərsa.
Yüzi gül, saçı sünbül, dişləri dür, ləbləri meygun,
Qaşı yay, kiprigi ox, gözləridir nərgisi-şəhla.
Özi insan və leykin surəti huriyi-cənnətdir,
Şəmimindən onun zökam olubdur ənbəri-sara.

Məsihavar əlacın bir mərizi-eşq üçün saxla,
Zəfər çox dərd çəkdi, ta ki, dərman eylədi peyda.

* * *

Sane odur, ədəmdə ikən verdi can mənə,
Artırdı mülkü malü məhəllü məkan mənə.
Xaru zəlil etmədi bu xəlq ara məni,
Ömrüm çox etdi, verdi əcəldən aman mənə.
Ənam etdi bizə bu dünya gözəllərin,
Lütfilə verdi nitqü şüurü bəyan mənə.
Dil verdi, şükri-nemətini edəlüm müdam,
Min şükr feyzi-rəhməti oldu əyan mənə.
Şad ol, Zəfər, könüldə dəxi üqdə qalmadı,
İki cəhanda ömür verir cavidan mənə.

* * *

Dəryadır eşq, müttəsil olmuş hübab ona,
Güzgüdür, ol ki, cilvə verir aftab ona.
Yandırmayınca eşq ürəgi eyləməz kəbab,
Pərvanə şəm görgəcin olur kəbab ona.
Zahid həmişə sərzəniş eylərdi aşiqə,
Mən daxi doğru sözləri yazdım cəvab ona.
Bir neçə nüsxə istədi məndən rümuzi-eşq,
Kəsdim tənabi-ömrüni, verdim kitab ona.
Cənnət bağı dedkdiləri yarın vüsalıdır,
Ey bülhəvəs, yerin tanı, vermə əzab ona.
Tapmaz, Zəfər, bu yolda o kim, vasil olmadı,

Hər kim xumar çəkdirə, odur şərab ona.

* * *

Eşq sevdasını qismət eylədi gərdun mənə,
Yardan ayrı təkəllüfdür gərəkməz can mənə.
Xəlq ara Fərhad ilə Məcnundən artı şöhrətim,
Dərd çox çəkdim, əlac etməz dəxi dərman mənə.
Qəmdən öldüm, kimsəyə ərz etmədim əhvalimi,
Barilaha, qismət eylə bir nəfəs iman mənə.
Sən zəfər ver, qalmışam yalqız, pənahım kimsə yox,
Dünyəvü üqbadə səndən qeyr yox sultan mənə.
Dünyəvü üqbadə səndən qeyr yoxdur dadrəs,
Çün əzəl gündən veribsən mehr üzündən can mənə.

* * *

Sidq üzündən etmişəm mən canımı yarə fəda,
Qəm çəkən əlbəttə olur yari-qəmxarə fəda.
Ey könül, çox dərd çəkdin bu fəna mülkündə sən,
Ta ki, canü dildən oldun yari-dildarə fəda.
Bir məcazi eşqə düşən, canını bəslər əziz,
Ol səbəbdən etmədin canını əğyarə fəda.
Yar bir qəmxar, bir dildar birdir aşiqə,
Ondan özgə qeyrdir, qeyr ola əğyarə fəda.
Ey Zəfər, şəkkər şikən oldun bu gün tutisifət,
Nəqdi-ömrün eylədin yari-şəkərbarə fəda.

* * *

Əlimdən ixtiyarım aldi bir dildari-bihəmta
Ki, var peydaliği punhan, vəli pünhalığı peyda.
Düşübdür başıma sevdayi-eşqi, olmuşam giryan,
Gözüm yaşı bu xəlqi-aləm içrə eylədi rüsva.
Səməndər tək yanar eşq atəşinə bu təni-zarım,
Həyatım ta ki, var, çıxmaz başımdan bu gələn sevda.
Qəmindən şalpuş oldum, tənimdir buriya nəqşi,
Yerimdir guşeyi-məscid, gərəkməz atlasü diba.
Zəfər, bağlı qapı açdı yüzimə dust babından,
Onun asarıdır ki, bu cəhanə düşdü yüz qovğa.

* * *

Çıxar qəmdən məni, ya kirdgara,
Nihan eybim sənədir aşkara.
Cəhanda səndən özgə dadrəs yox,
Çox etdim hər ədu ilən müdara.
Əgər yar olsa lütfün bu həqirə,
Ələ gəlir kilidi-mülki-Dara.
Sühayə gər nəzər qıl sən, ilahi,
Olur nuri günəş tək aləmara.
Qiyamət günidə əfv et günahın,
Şəfi etgil rəsulun, kirdgara.
Əqiqə döndü ətrafi-Yəməndə,
Zəfər göz yaşidin hər səngi-xarə.
Zəfər zülmət içində qaldı heyran,
Sən olgil Xizri-rəhi, pərvərdigara.

* * *

İlahi, başıma salmış həvayi-eşq bir sevda,
Ki, bu sevda ilən vardır cəhan mülkündə min qovğa.
Səni zahirdə tapmaq bəndəyə müşküldürür, yarəb,
Könüldə zahirin peyda irir etdi məni rüsva.
Səməndər tək məni eşq oduna saldı öz odumdan,
Mənim suzimni görgəc gülgə batdı bülbüli-şeyda.
Olub gül yüzinə mail beş-on gün çəkdi əfğanı,
Mənim tək olmadı daim sənin eşqində pabərca.
Əgər Məcnun yaxıb eşq atəşinə cismi-üryanın,
Gözü ayinəsinə əks saldı surəti-Leyla.
Əgər Fərhad Şirin eşqdə canın fəda qıldı,
Zəfər, göz yaşidin ləli-Bədəxşan oldu hər xara.
Və gər pərvanə yaxdı şəm oduna pərü balin,
Zəfər həm eylədi eşqin yolunda özünü rüsva.

* * *

Şükrlillah, ey gözəl, dərdin nəsib olmuş mənə,
Yetməsin bu çərxi-gərdundən yəman gözlər sənə.
Çatlasun bol göz, sənin saruyə istər kəc baxa,
Xaki-payindir sənin xahiş gözümə tutiyə.
Bir könül kim, səni sevdi, qıldı tərki-xanüman,
Aşiqə  canan vəfa eylər, nə bu dəhri-fəna.
Yüz min ildən sonra Məcnun ilən Leyli söylənir,
Xəlq arasında bu san məşhurdur ömri-bəqa.
Köhnə oldu dövrdə Fərhadü Şirin qissəsi,
Söylənür şimdi Zəfər eşqi bu günlər xəlq ara.

* * *

Yarəb, sənin bir adınadır nəqdi-can bəha,
Zatın qədimdir ki, ona yoxdur intəha.
Hər kim sənin yolunda fəna görmədi özün,
Yoxdur iki cəhanda onun ömrünə bəqa.
Sənsən verən bəşarəti-ümmidü bim bizə,
Etdin Kəlim əsasını xunxarə əjdəha.
Tapdı Rəsul mərhəmətinlə məqami-qürb,
Yasin oldu mənziləti, vəsfi Tavü Ha.
Yəqub əgərçi çəkdi isə möhnətü ələm,
Yusif cəmali verdi onun gözünə cəla.
Tapdı həyat adəmi-xaki ze ruhi-qüds,
Axırda xak oldu ona mənzili-bəqa.
Yarəb, sənin sözünə Zəfərdir ümidvar,
Ol bikəsi bu dami-küdurətdən et rəha.

* * *

Ey rəqibim, halımı bil könlüm əfğanın görüb,
Sormagil bu xəstə halın gözlərim qanın görüb.
Vəsldə gər xali-hündusin görüb yansam oda,
Mən′ etmə kim, yanarsan daği-hicranın görüb.
Sinəmi məcruh edibdir tiri-müjganı onun,
Rəhm edərsən halimə şol qanlı peykanın görüb.
Gözlərinin mərdümi etmiş könül seydinə qəsd,
Rəm edər ahu kimi şol xeyli-müjganın görüb.
Etmədi dərdimə dərman Xızrü İlyasü Məsih,
Ömri-cavid istədilər abi-heyanın görüb.
Şəm tək suzi-nihan yaxdı Züleyxa canını,

Yusifin töhmət sözündən bəndi-zindanın görüb.
Bülbüli-şeyda nəvayi-eşq tutdu bağ ara,
Bir nəzər ta qönçənin gülbərgi-xəndanın görüb.
Dövrə saldı saqiyi-siminbədən göz sağərin,
Başə çəkdi badəni sibi-zənəxdanın görüb.
Bu Zəfər canın fəda qıldı onun gül yüzinə,
Valeh oldu gözləri çaki-giribanın görüb.

* * *

Gözlərinin nəşəsi etdi məni məstü-xərab,
Eşq dəryası üzində gəzərəm misli-hübab.
Hicr odundin cismi-zarim şəmdin giryandurur,
Cigərimdin hər nəfəs dişra gəlir buyi-kəbab.
Yar vəsfində yazıldı, altı min beytü qəzəl,
Bəhri-eşqim saldı suyuna cümləsini bab-bab.

* * *

Mahi yüzin pərdəsi olmuş səhab,
Ay yüzünə yaxşı yaraşmaz niqab.
Gün gəlülən səndən edər kəsbi-nur,
Əksi-rüxün tələtidir mahtab.
Məst gözünün mərdümidir rahzən,
Mey içübən etdi cəhani xərab.
Xəncəri-xunrizini almış ələ,
Mənə der ver, mənə qanlu kəbab.
Gər cigərin var isə, qoy çıxarım,
Aşiq isən dinməgilən heç bab.

* * *

Günəhkarəm, cəhan içrə məni xar eyləmə, ya Rəb.
Kəməndi-zülfi-piçanə giriftar eyləmə, ya Rəb.
Əzəldən gün kimi məşhur etdin zərrəni yerdə,
Əbəd mülkində daxi xar ilən zar eyləmə, ya Rəb.
Xəm oldu qamətim həmmal tək əsbabi-üsyandan.
Zəifəm, bundan artux boynuma bar eyləmə, yar Rəb.
Hökumət eylədim çox, bu cəhan mülkindən usandım,
Mənə künci-qənaət mənzilin-dar eyləmə, ya Rəb.
Zəfər, verdin cəhanda düşmənimi xarü zar etdin,
Məsiha minnətin çəkməkdə bimar eyləmə, ya Rəb.

* * *

İmami-cümlə insü can Əli ibni-Əbi Talib,
Könül mülkindədir sultan Əli ibni-Əbi Talib.
Rəvadır hökmi can içrə, çü can ruhi-rəvan içrə,
Gəzər kövnü məkan içrə Əli ibni-Əbi Talib.
Olubdur baisi-kəsrət, içibdir badeyi-vəhdət,
Bulubdur qürbdən izzət Əli ibni-Əbi Talib.
Bir adı Heydəri-Səfdər, bir adı Saqiyi-kövsər,
Üçüncü Xaceyi-qənbər, Əli ibni-Əbi Talib.
Nəbiylə «ləhmükə ləhmi» söyləşdi, «dəmükə dəmi»,
Vəsidir «cismükə cismi» Əli ibni-Əbi Talib.
Zəfər quldur ona candan, keçibdir xan ilən mandan,
Ayırmaz axır imandan Əli ibni-Əbi Talıb.

* * *

Pərdədə çox qaldı rövşən aftab,
Ya Əli, salgil gün üzündən niqab.
Aləmi qılgil münəvvər gün kimi,
Mehr üzinə yaxşı yaraşmaz hicab.
Zilləti-küfr aldı yer yüzin təmam,
Aləmi təsxir üçüdür aftab.
Gözümə gəlməz yuxu bu qüssədən,
Cismi-zarımdan kəsildi xürdü xab.
İstərəm saqiyi-kövsərdən, Zəfər,
Ta ki könlüm olmadin qəmdən kəbab.

* * *

Valeh oldum, ey pəri, ol çeşmi-fəttanın görüb,
Məst oldum ta ləbi-ləli-dürəfşanın görüb.
Əqlimi tarac etdi türkütazi-mərdümin,
Odlara düşdü tənim sibi-zənəxdanın görüb.
Şəmi-ruyin görəli pərvanə tək yandım ona,
Su səpildi könlümə sərvi-xuramanın görüb,
Qılmış idi şərhə-şərhə sinəmi daği-fərağ,
Xatirim cəm oldu çün zülfi-pərişanın görüb.
Fariğ idim eşq əlindən, seyr edirdim aləmi,
Xəstə düşdüm ta kəməndi-zülfi-piçanın görüb.
Ta yüzün gördüm, rəfiqimdir Zəfər şamü səhər,
Qönçə tək açıldı könlüm ləli-xəndanın görüb.

* * *

Xəm oldu qamətim, hicran əlindən, ver şəfa, ya Rəb,
Vüsali-yardən qeyri mənə yoxdur dəva, ya Rəb.
Məcazi eşq ilən yoxdur işim zahid kimi daim,
Həqiqət nəşəsindən ver mənə cami-bəqa, ya Rəb.
Ayırma bəndəni məhşər günü saqiyi-kövsərdən,
Onun mehri iləndir könüldə zövqü səfa, ya Rəb.
Cəhanda çox hökumət eylədim, gördüm vəfası yox,
Çəkildim küncə, lütfün kəsməgil ta müntəha, ya Rəb.
Yetişdi ömr yetmiş dördə, gəldi mövsümi-piri,
Cəhanda görmədim heç kimsədən buyi-vəfa, ya Rəb.
Zəfər verdin mənə, düşmənlərimi, xarü zar etdin,
Behəmdüllah ki, səndən görmədim bir kəz cəfa, ya Rəb.

* * *

Ey könül, zöhhadə uyma, guşeyi-meyxanə tut,
Eşqdən mən′ eyləyəndə, sən ona peymanə tut.
Dilbərin şəmi-cəmali cilfəgərdir bəzmdə,
Vaizin sözün eşitmə, sən rəhi-pərvanə tut.
Bülbülün əfqanını eşit, səhərgəh bağ ara,
Zahidə tutma qulağın, ol çəkən əfqanə tut.
Aqil ol, divanənin yoxdur sözünə etibar,
Ol rəhi-səhra tutanda, sən rəhi-fərzanə tut.
İxtiyarım aldı əldən bir büti-tərsa beçə,
Şeyx Sənan tək, könül, gəl daməni-bütxanə tut.
Ta aça bağlı qapı yüzinə fəth ilən Zəfər,
Müğbəçə sevdin çu hindu rahi-atəşxanə tut.

* * *

Eşqə düşdün, ey Zəfər, gəl rahəti-canı unut,
Yetmədin bəzmi-vüsalə, hicri-cananı unut.
Ərsə təng oldu xəzan, ömrə yoxdur etibar,
Püsteyi-xəndanivü sübi-zənəxdanı unut.
Dilbərin mehrabi-əbrusinə eylərdin nəmaz,
Ta pərişan olmadın, zülfi-pərişanı unut.
Tök gözün yaşın nədamətdən gecələr ta səhər,
Nəş′eyi-ləli-ləbü yaquti-rəmmanı unut.
Çün ayaq çəkdin bu dünyanın evindən, ey Zəfər,
Şövkəti-mülki-Süleymanivü sultanı unut.

* * *

Cəhan mülkinə həqdən qeyri yoxdur heç kim varis,
Qədim oldur, onun əmri ilən olmuş cəhan hadis.
Yaratmış bəndəni ki, əmrinə münqad ola daim,
Verən oldur, alan oldur, hər işdə bəndədir bais,
Yetirür rizqini mur ilə marın bisəbəb yerdən,
Səpər torpağə toxmi nəf üçün qatil olan haris,
Cəhan xəlqi uyubdur qeybətə, cəhl ilə qafildir,
Bu fikri eyləməz kim, duzəx odunda yanar xabis.
Zəfər, uyma iki üzlüyə, sözün bir söyləş daim,
Bir olur bəndəlik yolu, heç olmaz sanivü salis.

* * *

Mən oldum xeyli xəlqə bais, əmma olmadım varis,

Ki, yoxdur etibarı bir şey kim, əslidir hadis.
Cəhanda görmədim bir kimsə kim, qövli ola sadiq,
İki sözlini çox gördüm, sözü bir görmədim salis.
Məsəldir, yaxşıya gəlməz yaman, dəryayə qərq olsa,
Onun halın bilir xaliq, vəli balığ olur bais.
Behiştdə təkyəgah eylər, içər su abi-kövsərdən,
Cəhənnəm odına yanar iki dilli ilən xabis.
Zəfər, tapmaz cahanda hər kişi bədxahi-xəlq olsa,
Küdurətdən onu torpağ altına təpər haris.
Əbəs bəhs eyləməz hər cahili-biəql ilən aqil
Ki, axır utanır bəhs etdigindən cahili-bahis.

* * *

Bahari-ömr keçdi, titrəşir cismim xəzan görgəc,
Ağardı muyi-sər qəmdən, cəsəd pozular tuman görgəc.
Tükəndi badeyi-işrət, dizimdə qalmadı qüvvət,
Mənə kar eylədi qürbət, gözüm ağlar cavan görgəc.
Rəvaru yaş tökməkdən kəsildi gözünün nuri,
Qəm aldı könlümün evin başımda rəngi-qan görgəc.
Gözümün qanlı yaşından nihalı pərvəriş tapdı,
Uzanır sərvi-rənanın qədi abi-rəvan görgəc.
Xəyalındır mənə mehman, könül təxtindədir sultan,
Səfərdə şad olur mehman şüküftə mizban görgəc.
Bu dünya malına verən könül üqbadə mürtəddir,
Satar imanını tüccar, malında ziyan görgəc.
Sarıldı boynuma zülfün kəməndi əfi ilan tək,

Olur qorxaq kişi qafil yuxusunda ilan görgəc.

Könül sevdayi-eşqə düşəli qəmdən Zəfər tapdı,
Müqərrərdir ki, köhnə no olur yarın cavan görgəc.

* * *

Göz çeşməsidə cilveyi-canana edər mövc,
Dərya yüzdə gövhəri-dürdanə edər mövc.
Yarın yüzünün əksinə göz ayinə oldu,
Mey bəzmi olan güşədə peymanə edər mövc.
Saqi ələ mey aldıvü doldurdu piyalə,
Şəmi-yüzidə sayeyi-pərvanə edər mövc.
Xüm daşıldı şövqündən onun gər puçi başdan,
Qan olmaq üçün nəşeyi-meyxanə edər mövc.
Məhv oldu Zəfər, qaldı onun yüzinə heyran,
Göz mərdüminin cilvəsi məstanə edər mövc.

* * *

Könlüm açılır sərvi-xuramanını görgəc,
Xoşhal oluram püsteyi-xəndanını görgəc.
Gün rəşk edər gül yüzini görsə səhərdə,
Məh parələnür navəki-müjganını görgəc.
Nəqqaş əgər çəksə qələm birlə cəmalın,
Titrər əli ol sibi-zənəxdanını görgəc.
Gər tab verə zülfi-pərişanını yüzdə,
Gün tirə olur çöhreyi-tabanını görgəc.
Duzəx qapısı bağlanıbən cənnət olur dəhr,
Qoynundakı sibü gülü reyhanını görgəc.
Fəth ilə Zəfər yar olur aşiqi-zarə,

Əsbablanır naz ilə samanını görgəc.

* * *

Getməyə dust kuyinə könlüm ilən etdim səlah,
Söylədi kim, gün yüzin görmək mübarəkdir səbah.
Şövqdən gözimə yuxu gəlmədi ol gecədə,
Ta müəzzinlər oxudular ki, «həyyə ələl fəlah».
Saqiyi-kövsər əlindən cami-vəhdət içmişəm,
Eşq sevdasın salıbdır könlüm içrə ruhü rah.
Hacılar hər ildə bir qurban edərlər Kəbədə,
Mən şəhidi-eşq oldum, ta ola qanım mübah.
Sülhi-küll etdim, cəhan xəlqi ilən yoxdur işim,
Ta ki, düşdü yar ilən aramızda sülhü səlah.
Ey Zəfər, bağlı qapılar xoş açıldı yüzinə,
Var, yarın torpağını çəkgil gözünə hər səbah.

* * *

Cəhan əhlində bir əhdi bütün yari-müvafiq yox,
Kimə izhar edim hali-dilim, könlümdə dərdim çox.
Yaqıbdır canımı eşq atəşinə bir büti-tərsa,
Rəvadir sancılır müjgan səfindən sinəmə yüz ox
Çəkilmiş qaşları yayı, nihan yerdən məni oxlar,
Fəğan kim, çeşmi-məsti tökməkü içməkdən olmaz tox.
Zəfərin oxuna bir xəstə canını hədəf qıldı,
Bu müşküldür ki, bir ox yerinə məcra olur yüz ox.
Nigarım, min rəqibin sözinə aldanma, al eylər,
Onun əhul gözinin mərdüminə növki-xəncər sox.

* * *

Bəzm ara saqi olubdur bir güli-xudrayə bax,
Gündən artıbdır ziyası, bədr olmuş ayə bax.
Gördi kim, mən olmuşam səhbayi-çeşmindən xərab,
Dövrə saldı sağəri, ol şuxi-bipərvayə bax.
Şöleyi-hüsni çıxarmış, şəm-başından tütün,
Gülləri odlarə yaxmış bu güli-həmrayə bax.
Bildi bülbül tək olubdur məskənim künci-qəfəs,
Halıma qılmaz nəzər, naz ilə istiğnayə bax.
Əşki çeşmi-xunfəşanım azim oldu payinə,
Dedim, ey birəhm, bir kəz mövc edən dəryayə bax.
Ey Zəfər, çün mən′ eylər eşqdən zahid məni,
Sözünə uyma, göz açıb ol güli-rənayə bax.

* * *

Hər kimə qismət əzəl gündən verildi nikü bəd,
Eşq sevdası mənə ol cümlədən duşdi rəsəd.
Könlümün ayinəsinə bəs ki, seyqəl vermişəm,
Gözünün pərdələrindən zail olmuşdur rəməd.
Bir əlifdir cümlə əşyanı mövcud eyləyən,
Sane oldur, vahid oldur, qulhu vəllahu əhəd.
Fikri-batin eyləməz zahid, gözü zahirdədir,
Məktəbə gəlmiş uşaq tək oxur Allahus-səməd.
Zahir oldur, batin oldur, əvvəl oldur, axır ol,
Hər nə kim əmr eyləsə, hökmi-rəvadir, ta əbəd.
Ey Zəfər, sən özüni ol yarə qurban eyləgil,

Lütfi-ehsanından özgə bəndəyə yoxdur mədəd.

* * *

Etmiş idi yar könlüm müstəmənd,
Bağlamışdı boynuma mişkin kəmənd.
Sərvi-rəna tək xuraman bir gecə,
Gəldi halım sordu kim, ey məstmənd.
Təlx imiş hicran odu göynəmiş səni,
Vəsl xoştərdir yanında, yoxsa qənd.
Söylədim kim, bu gecə vəslindəyəm,
Yandırıram atəşə müşt sipənd.
Kim, vüsalına irişdim bu gecə,
Ayrı bilməm ləblərindən şəhdi-qənd.
Söylədi, ey aşiqi-zarım, Zəfər,
Var imişsən risteyi-zülfimdə bənd.

* * *

Hicr əlindən qəmli könlüm olmadı bir ləhzə şad,
Yar-bədxu, çərxi-kəcru, ömrə yoxdur etimad.
Heyf kim, keçdi şəbabi-ömr, gəldi vəqti-şəb,
Könlüni saf etmədi mənimlə çərxi-kəcnihad.
Zülmət oldu, dudi-ahimdən tutuldu mehru mah,
Yüzimə bağlı qapular olmadı bir gün güşad.
Vəsl şəhdi yerinə səm verdi bu dövran əvəz,
Qüssə çəkməkdən verildi hasili-ömrüm bebad.
Bu həman dövri-zəmandır kim, urubdur bir yerə,
Tacü təxtü, mülki-Cəmşidü səriri-Keyqubad.

Ta Zəfər yar olmayınca bir dəxi mümkün degil
Kim, düşə sərvəqtimə bu çərxi-duni-kəcnihad.

* * *

Qələm aldım ki, yazım əz qəmi-hicran kağız,
Qanlı çeşmim suyidin oldu Zərəfşan kağız.
Oda yandı cigərim, dud ilə çıxdı ahim,
Başı yıxılmış  ilan oldu o bican kağız.
Güli-rəna kimi ki, sarı olub, gahi sorx,
Sərbəsər oldu yüzi sorx güləfşan kağız.
Od şərarı düşübən canına yandı belə kim,
Dilə gəldi, elədi ah ilə əfğan kağız.
Bəs ki, yazıldıvü pozuldu, qara oldu yüzi,
Yayxadı suya qamu dəftərü-divan kağız.
Qanlu çeşmim suyu əz-bəs ki, gözümdən axdı,
Ağ ikən rəngi dönüb çün güli-reyhan kağız.
Ey Zəfər, səbr elə, ta ki, vüsalə yetəsən,
Sənin ahindən idi, eylədi əfğan kağız.

* * *

Yüzin görgəc könül quşini saldı məndə bir dilbər,
Onun qeydindən azad olmağa yoxdur bizə rəhbər.
Tutuşmuş şəmə döndü cismi-zarım eşq odundan,
Məgər pərvanələr söndürməgə cəm olalar yeksər.
Könüldə saxladım eşq odunu məcmər kimi axır,
Məni rüsvay qıldı dəhrdə seylabi-çeşmi-tər.
Oda düşmüş yılan tək gecə-gündüz piçü tabım var,

Onun gül çöhrəsinin tabından canında var əxkər.
Cəhanda yar üçün çox seyr edib axır, Zəfər, tapdım,
Mən oldum mehr üzündən bəndə ona, ol mənə rəhbər.

* * *

Tazə dilbər şövqi düşdi başimə piranəsər,
Şükrilillah hasil oldu mətləbim bidərdü sər.
Taleim oldu zəfər yulduzi ilə toəman,
Aqibət yetdi yerinə çəkdigüm ahi-səhər.
Canıma düşmüş idi eşq atəşi bülbül kimi,
Bir gül üzlü yar üzündən rövşən oldu ceşmi-tər.
Heyf kim, əgdi şücaət qeyrəti əndamimi,
Zəf arti günbəgün olmaya tək yövmül-betər.
Baş ağardı, diş töküldü, beldə qüvvət qalmadı,
Həlqə oldu, yayə döndü sərvi-rəna tək kəmər.
Səbr edib çəkdim ayağı bir qənaət küncinə,
Yar ola bir gün məgər tovfiq ilən fəthü Zəfər.

* * *

Qeyr gər bilməsə hali-dilim, Allah bilir,
Könlümün sirrini hər nəstə isə şah bilir.
Mehri tək mehri könül evini pürfeyz etmiş,
Dərdi canımdan nihan olduğun ol mah bilir.
Təni-zarımnı əgər yaxdı isə hicr oduna,
Gah əgər qədrimi ol bilməz isə, gah bilir.
Şükr kim, doğru yola saldı məni lütfi-xuda,
Mən bilən yolu qaçan cahilü gümrah bilir.

Müddəi rəğmi ilə tapdı Zəfər Rahi-nicat,
Çün kəminə özünü bəndeyi-dərgah bilir.

* * *

Tutuşdu hicr oduna cismi-zarım, vəsl mümkindir
Gəh yürəgim, yandı bir kəz şöleyi-atəşdən iməndir.
Məni dindən çıxardı sehr ilən bir kafəri-hindu,
Könül, şad ol ki, yanmaz atəşə hər kim ki, mömindir.
Əgərçi ayrı düşmüşəm vətəndən, yoxdur aramım,
İməs qürbət könül şəhri içində yar sakindir.
Yəqinim hasil oldu, iztirabım getdi könlümdən,
Səadət yulduzilə əxtəri-bəxtim müqarindir.
Gözüm mərdümləri xali-ləbin gözdən nihan etmiş,
Rəqib olmuş mənə pünhan, könül mülkində xaindir.
Zəfər, bağlı qapı açdı yüzimə dusti babından
Qəm əhlinə deyin gəlsin, bu gün bizdə xoş ayindir.

* * *

Eşq edir bülbüli-şeyda kimi aşiqləri zar,
Vəslə çün yetdi Xəlil, od ona oldu gülzar.
Ol zamandan məsəl olmuş gülü bülbül rəmzi,
Xəlq ara eşqü məhəbbət şölənür leylü nəhar.
Eşq dediklərinin əsli məhəbbəti-vəzindür,
Hər kimi yar əziz etdi, daxi etməz xar.
Tinəti bəd olanın əsli əzəl gündəndir,
Hənzəlin töxmü olur təlxü özü qeyri-əsldəndir.
Cənnətə qabil iməs kündeyi-duzəx, ey dil,

Gəl Zəfər, söz eşit, ağlına şükran …

* * *

Çəkdim isə bu fəna dünyadə beş gün dərdi-sər,
Aqibət fəryadimə yetdi dəmi-ahi-səhər.
Talibi dünya olanın gözü doymaz dünyadan,
Mal cəm etməkdən ötrü fərq etməz xeyrü şər.
Zahidin xəlvətdə daim xəlq üçündür taəti,
Bağdan dişra olan ağac başı verməz səmər.
Mürtəza qulu olanın kini olmaz könüldə,
Hər xəta görmüşlərin könlündə var buğzi-Ömər.
Ey Zəfər, doğru olanın mülkinə yoxdur zəval,
Əgri olan bu cəhanda bağlamaz hərgiz kəmər.

* * *

Sanmagil hər toz yeyən kişi sənə yoldaş olur,
Bir yaman gün başa düşəndə sənə sirdaş olur.
Necə kim, bir övrət iki kişidən doğdu oğul,
Ol sənə qardaş olmaz, bəlkə qarındaş olur.
Ta cəhanda dövlətin var, bəndəfərmandır sənə,
Dövlətin çün getdi əldən, varuban övbaş olur.
Mərdumi-çeşmim gözüm yaşını məhrəm eyləməz,
Çünki, mərdümzadədir, ol gözdən yaş olur.
Göz yaşı ondan məni rüsva edibdir aləmə,
Bəhr ara tutsam vətən, xəlqi-cəhanə faş olur.
İticə yağdırdı sənə ətfal əlindən daş fələk,
Kim tüpürsə, xəlqi-aləm, yer yüzi pür daş olur.

Yar hüsni günbəgün əfzun olubdur, bilmənəm,
Onu əfzun eyləyən yüzində göz, ya qaş olur.
Kuhkən eşq üstə getdi, binəva Məcnun dəxi,
Ey Zəfər, məşhər günü onlar sənə yoldaş olur.
Dün gecə hicran odundan tirə oldu gözlərim,
Bilmədim yarın yüzində yengi ay, ya qaş olur.

* * *

Sərv tək gər cilvə qılsan bağ ara, ey sərvnaz,
Can fəda eylər ayağın tozuna əhli-niyaz.
Qaşların taqinə mən səcdə onunçün eylərəm
Kim, qılallar Kəbənin evinə əz hər su nəmaz.
Bir dil ilə mən sənə razi-dilim deməyincə,
Yüz dil ilə gər desəm, qalır könüldə cümlə raz.
Şəmi-rüxsarın məni pərvanə tək qovdu gecə,
Danadək bitab idim, can qoymadı məndə güdaz.
Ya Zəfərin gözünün mərdümlərin eylə sipənd,
Ya yüzini gizləgil, etgil gözümdən ehtiraz.

* * *

Onun mehrindən özgə zar könlüm rahbər bilməz,
Zəifü natəvandır, eşqdən qeyri hünər bilməz.
Urardı tişəni Fərhad hər Şirin həvasilə,
Başında yar sevdası olan kuhü kəmər bilməz.
Əgər Məcnun həvayi-Leylidən rusvayi-xəlq oldu,
Onun halın nə bilsin ol ki, bir ahi-səhər bilməz.
Çəməndə xar olub bülbül, gül üçün gər çəkər əfğan,

Başında eşq sövdası olan şamü səhər bilməz.
Riyayi-eşqə düşdü bülhəvəs, rüsvayi-xəlq oldu,
Oların tutduğu yolu, bəhəmdüllah, Zəfər bilməz.

* * *

Arif olan sirrini hər kimə izhar eyləməz,
Yar güldür, aşiqini bisəbəb xar eyləməz.
Zahirü batində birdir aşiqin könlü müdam,
Yarsız gər bağə girsə, seyri-gülzar eyləməz.
Dizini qucaqlayıb yatır əgər yar olmasa,
Öz yarından qeyri meyli-özgə dildar eyləməz.
Bu cəhanda görmədim bir əhdi bütün dilrüba,
Gözümü giryan görər, fikri-gühərbar eyləməz.
Aşiq oldur canın qurban edə cananına,
Hər könül kim, canın istər, fikri-dildar eyləməz.
Şəm′ə yanmaqdan pərvanənin nə bakı var,
Kəbeyi-eşqə irən fikri-girənbar eyləməz.
Ey Zəfər, giryan gözün etdi səni-rusvayi-xəlq,
Deme daxi kimsə sirr sözüni izhar eyləməz.

* * *

Olmadım dövri-fələkdə bir nəfəs azarsız,
Cövrinə qatlanmaq olur, olmaq olmaz yarsız.
Bir tərəf azari-aləm, bir tərəfdən səg rəqib,
Almış ortayə mənivü qalmışm qəmxarsız.
Ey sitəmkar yar, bir rəhm eyləgil əhvalimə,
Qönçə tək pəjmürdə oldu xatirim dildarsız.

Ülfəti kəs səg rəqibdən, xəstə könlüm şad ola,
Demə kim, bustan ara gül hərgiz olmaz xarsız.
Munca dərdlər səndən ötrü çəkmişəm, ey külüzar,
Gəl Zəfərlən yar olgil, qoymagil qəmxarsız.

* * *

Yar vəslindən cüda pamali-dövranəm hənuz,
Yanaram eşq oduna, bimari-hicranəm hənuz.
Xatirimdir cəm kim, qeyr ilə yoxdur ülfətim,
Demə kim, yad olmuşam, dər fikri-cananəm hənuz.
Gözlərimdən qanlı yaş axmaqdan oldum bibəsər,
Buyini çəkməkdə, bilgil, piri-Kən′anəm hənuz.
Gər gəda tək dərbədər düşdüm vüsalından cüda,
Öz yanımda fikrün ilən şah, sultanəm hənuz.
Bir kəminə çakərindir bu Zəfər, ey gülüzar,
Düşmüşəm gər nəzərindən bəndə fərmanəm hənuz.

* * *

Ey fələk, etdin mənə bu dövrdə azar bəs,
Eylədin bülbül kimi azar əlindən zar bəs.
Zəgfəranə döndü bənzim, laləsi hicran yetər,
Gər vüsalə yetməsəm, könlüm olur əfkari-bəs.
Küfrə saldı könlümi yarın müşəvvəs zülfləri,
Çünki dami-eşqə düşdüm, etdi istiğfar bəs.
Dünyada yandırdın isə, duzəxə salma məni,
Boynuma bağladın axır rişteyi-zünnar bəs.
İstəməm səndən bu dünya mülki ilə malını,

Mətləbim budur cəhanda, ol pərirüxsar bəs.
Sinəmi məcruh etdi əgri-əgri baxmağı,
Çəkdi xəncər qətlimə ol qəmzeyi-xunxar bəs.
Bu Zəfər yalquz qalıbdır iki düşmən əlidə,
Munca kim, azar qıldın çərxi-kəcrəftar bəs.

* * *

Eşq tərkin eyləməm, ta var bədəndə bir nəfəs,
Mənə derlər, gər həvəsdir eşq bəsdir, bu həvəs.
Yar cahildir əgər başında vardır çox qürur,
Ayağı kəsməm kuyindən, deməsinlər bülhəvəs.
Başlarında bu cəhan sevdası var zahidlərin,
Heç deməzlər kim, yetişir dadə bir fəryadrəs.
Eşqdən qafil olanlar səngsar eylər məni,
Könlümün şişəsinə dəgsə sınar pərməgəs.
Pasibanəm gecə-gündüz kuyində ol dilbərin,
Bülbüli-şuridəyə xoştər gəlir künci-qəfəs.

Ey Zəfər, səbr eyləgil bu dəhri-dunin cövrinə,
Yetişir bu gün sənin fəryadına fəryadrəs.

* * *

Tərk etmə, ey könül, yarın həvasin bir nəfəs,
Bivəfa yarə könül vermə, sənə bir yar bəs.
Çək başın bu dəhri-fanidən qənaət küncinə,
Bülbüli-şeyda kimi aramgahindir qəfəs.
Ey Zəfər, canı fəda qıl bir vəfalı dilbərə.

Yar vəslin gər dilərsən, qeyrdən peyvəndi kəs.

* * *

İxtiyarım aldı əldən nigari-hurvəş,
Məst ikən məxmur oldum, gəzərəm divanəvəş.
Sağər almış əlinə, doldurubən içər müdam,
Gözlərimin mərdumi tək olmuşam xəmyazəkəş.
Qaşlarının taqini əgmiş qurulmuş yay kimi,
Gül cəmalın ta ki, gördüm, mürgi-ruhim etdi ğəş.
Saqiya, gəl dövrə salgil sağəri, məst olalım.
Bəs xumar olduq zəmani, həm olalım badəkəş.
Bəh təki pəşminəpuş olmaq zamanı, vəqtidir,
Bizə dəxi xoş yaraşmaz böylə gündə kəşü fəş.
Ey Zəfər,  fərzanə idin, gəl bu gün divanə ol,
Gəzgilən Məcnun kimi bir neçə gün divanəvəş.

* * *

Qoymadı şami-fəraqın bu könüldə əqlü huş,
Badə vergil, könlümü qəmdən çıxar, ey meyfüruş.
Huşimi aldı əlimdən həm fəraqın, həm xumar,
Həm götürər, həm aparar mey aradan əqlü huş.
Badeyi-vəhdət içən daim behiştdə seyr edər,
Dün gecə gəldi qulağıma səmadən bu sürüş.
Gün yüzini gər bulut tutsa, bil onun vəchini,
Məh cəmalın rəşkdən olmuşdur ol pərdəpuş.
Ləli-meygunin xəyalindən siyəhməst olmuşam,
Yaxud çeşmin sağəridən olmuşam mən badənuş.

Bu Zəfər ruzi-əzəldən məstü mədhuşindürür,
Eybi çoxdur bu cəhanda, olgilən sən eybpuş.

* * *

Gəh saraldı, gəh qızardı rəngi-zərdimdən qumaş,
Eşq pünhanimni etdi bu cəhan xəlqinə faş.
Verdigini aldı əldən bu sipehri-nilgun,
Etməmişdim hərgiz ondan mənsəbi çün mən təlaş.
Gəh götürdü çərx üzinə, gəh saldı toprağə,
Heyf kim, yoxdur onun təb′ində bir əqli-məaş.
Zəhr qatdı aşimə, heç bilməzəm fikri nədir,
Düşməninə heç kişi içirməyibdir qanlı aş.
Oduma yağmur yerinə səpmədi bir qətrə su,
Günbəbün yağdırdı başım üzərinə türlü taş.
İntiqamın çəkdi axır bu Zəfərdən ol xəsis,
Salü məh ol binəvayi eylədi sahibfəraş.

* * *

Xəncərin acısı, ey sərvi-rəvan, canıma xas,
Qəmzədən atılan ox bu təni-üryanıma xas.
İstəgil bəzminə bir eyşü tərəb xaslərin,
Gər bizə sən gələsən külbeyi-viranimə xas.
Aşiqəm, vəsfini necə edəyim bir dililə,
Şövqinin mərtəbəsi dəftərü divanıma xas.
Bülhəvəslər nə bilir eşq fününin, ey yar,
Bir qəbadır ki, gəlibdir Zəfər əndamına xas.

* * *

Biri ki, Kəbə sarı dildə bağladı ixlas,
Özini məscid ilən xanəqədən etdi xilas.
Könül, xilas dilərsən, əyan qıl ixlasın,
Müyəssər ola degil, olmadın əyan ixlas.
Riyayi xəlq kimi etmə özüni zahir,
Çü batin evi degil, cəm yoxdurur ixlas.
Həvas çün mütəfərriqdürür, riyadır işin,
Əvam surəti tək özüni bilirsən xas.
Səmavü vəcd birlə xəlqi yoldan azdırma,
Özün arayə salıb zən tək olmagil rəqqas.
Zəfər, olarə qarışma, riyadən ol fariğ,
Qənavü fəqrü fəna bəhri içrə ol qəvvas.

* * *

Dilbərin şövqindən eylər badə imən cam rəqs,
Saqiyə, vergilən kim, püxtə olsun xam rəqs.
Gün xəcil olur keçəndə qəsrü bamından onun,
Zöhr eylər zərrə tək ol kuydə ta şam rəqs.
Şahidi-bəzmin dəxi könlüni alın mey bilə,
Etməsin məclis yüzində nəşəsiz nakam rəqs.
Xanəgah xəlqinin ol aradə yeri yoxdurur,
Çün riyayi işləri var, olmasın bədnam rəqs.
Ey Zəfər, bu növ rəqsin bir mübarək halı var,
Hər kişi təmkin ilən rəqs etdi, olmaz xam rəqs.

* * *

Dilbərin fikri ilən oldu könül eşqə həris,
Yusifin iyini verir parə olan qanlı qəmis,
Çox bəha xəlq verir nazik olan göftarə,
Qiyməti əksik olur şeir, əgər olsa rəxis.
Bir neçə beyt yazıldı, var idi qafiyə təng,
Kisrət əz xəlq ara olsa olur cayi ləhis.
Könlümüz meyli çəkər yazıya, seyd etmək üçün,
Qəm könüldən gedərir badə ilən seyri-qənis.
Qissə eşitməgilən bisərü pa molladən,
Yalanı cəm edib xəlq ara eylər təlxis.
Ey Zəfər, təcrübəkar olmayan işin bilməz,
Bu səbəbdən elədin dəhr ara min təmhis.

* * *

Fəryad olmadım qəm əlindən dəmi xilas,
Dərdimə çarə qılmadı bir ləhzə amü xas.
Gəldi həvayi-eşq başə, getdi əqlü huş,
Ol dərdi-eşqədir mütəvəcceh qəmu xəvas.
Miskin Zəfər bəlayə duşubdur bu dəhrdə,
Ya rəbb, inayət ilə sən eylə onu xilas.
Çox dərd çəkdi, bəndəligin eylə sən qəbul,
Məhmudi-dəhr sənsənü oldur Əyaz xas.

* * *

Könlümü eylədi bülbül kimi şeyda ariz,
Bağ ara görsədəməz ol güli-rəna ariz.
İkiyüzliligini eylədi xəlqə zahir,

Sürtərəm torpağa bağ ara dəmadəm ariz.
Taqətim yox ki, iki od məni yandıra müdam.
Hicr oduna yanayım söylə könül, ya ariz.
Düşmüşəm eşq oduna, mənə sarı bir baxmaz,
Əcəb olmaz ki, gələ, edə tamaşa ariz.
Yüzümü bir ayağ ilə qızartgil, saqi,
Necə sürtüm ayağinə məni-rusva ariz.
Ey Zəfər, istər isən dövləti-baqi tapmaq,
Şeyx Səfi dərgəhindən dərgəh, tutma ariz.

* * *

Eşq cövhərdir könüldə güzgisi olmuş ərəz,
Ol mücəlla güzgidə yarın cəmalidir ərəz.
Gər əlində olmasa dinar miskin aşiqin,
Dilbərin vəslinə irsə, canını verür əvəz.
Bu əcəb bimari-eşqin dərdini bilməz təbib,
Görməgə gəlgəc tutar əl, ta edə təşxisi-nəbz.
Yar lütfidir, Zəfər, bimari-eşqə can verən,
Ondan özgə çarəsi yoxdur, çu artıqdır mərəz.
Bülhəvəs eşq atəsi yandırmağın od  tək bilir,
Cövhərin halın nə bilsin ol cəmadi-pürqərəz.

* * *

Könül, əgmə təriqini, eyləgil məzbut,
Riyavü şirkü dəga birlə eyləmə məxlut.
Bu yolda şərt fənadır, əgər könül versən,
Qədəm bu yola qoyub getmə rahi-naməşrut.
Əlindədir kişinin işkili, fəalinə bax,

Fəali yaxşı gərək, sözü olsa namərbut.
Könül səhifəsindən məhv eylə nöqtəsin,
Ki, Allah adına kafir məgər qoya mənqut.
Gedərsən özgəsinin yükünü yüngül edə,
Olur, Zəfər, axır arxada öz yükün məsqut.
Fəna riyazətidə qamətin qılan çovqan,
Gözinə top kimi gəlməz bu künbəzi-məxrut.

* * *

Ey könül, düşmüş başına arizuyi-xalü xət,
Mərhəmi qəflət yüzində mücrim eylər bir nəqət.
Bivəfa yarə könül verdin, qəmindən zar olub,
Etmədi əhvalını sormağə bir kəz o qələt.
Hicr odundan tutuşdu cismi-zarın ney kimi,
Gözlərindən qanlı yaş oldu rəvan manəndi-şətt,
Mərdümi-çeşmin yüzər ol nəhr ara balığ kimi,
Balığ tək rəngi qaralmış su üzündə misli-bət.
Ey Zəfər, tutgil qulaq bir dəm Füzuli şerinə,
Ondan özgə heç şair şeir deməz bu nəmət.
Qüdrəti yoxdur fəqirin şəhri-vəslin eyləyə,
Şəmmə sünində əl titrər, yaza bilməz nəqət.

* * *

Eşq dildardan olur məhzuz,
Qəmli qəmxardan olur məhzuz.
Bülbülün könlü açılır güldən,
Mar olan xardan olur məhzuz.

Bu cəhan xəlqidir qəmu həmmal,
Barkeş bardan olur məhzuz.
Hər kimin var başında bir sövda,
Bu könül yardan olur məhzuz.
Meykeşin saqi ilə ülfəti var,
Məst xummardan olur məhzuz.
Mütribin nəğmə ilədir həvəsi,
Kargər kardan olur məhzuz.
Ey Zəfər, yar tərkin eyləməgil,
Adəmi yardan olur məhzuz.

* * *

Əql fərzanədən olur məhzuz,
Cəhl divanədən olur məhzuz.
Şöylə şur bir-birilə nazü niyaz,
Eşq cananədən olur məhzuz.
Eşq odu düşəndə canü tənə,
Şəm pərvanədən olur məhzuz.
Bülbülü gül çü gəldi gülzarə,
Bağ həmxanədən olur məhzuz.
Ey Zəfər, saqi ilə ülfət tut,
Ruh peymanədən olur məhzuz.
İşrət et bir gözəl məkan içrə,
Cüğd viranədən olur məhzuz.

* * *

## TƏRCİBƏND

Eşq odu canü dildə çəkdi şüa,
Eylədür zərrə kimi rəqsi-səma.
Yoxdurur candan özgə qeyri-məta,
Əlvida, əlvida, ey saqi,
Tökdü qanım fələk çü nari-füqa.

Gəlgil, ey saqi, mürəssə ayağ,
Eşq odundan bilindi xəbti-dimağ,
Gəldi möhnət günivü getdi fərağ,
Əlvida, əlvida, ey saqi,
İçdi qanım fələk, çü nari-füqa.

Xar olubdur gözümə gülşəni-bağ,
Məskənim qəmdən oldu damənrağ,
Bülbülün yerin aldı kərkəsü zağ,
Əlvida, əlvida, ey saqi,
Tökdi qanum fələk, çü nari-füqa.

Bu Zəfər, xaksarü yari-məta,
Necə olsun aradə tərhi-niza,
Artı başımda dərdi-rənci-səda,
Əlvida, əlvida, ey saqi,
İçdi qanum fələk çü nari-füqa.

* * *

Gəldi bahari-dilgüşa, geydi libasi-Xizri-tağ,
Sünbülü gül açılmadin girdi səmai-tərfi-bağ.
Bülbüli-zar şövqdən başladı zirü bəm nəva,
Köçdü çəmən məkanidin ləşkəri-rusiyahi-zağ.
Saqi bəzmi-mey çəkib sundu mənə piyaləni,
Qəm götürüldü aradan, gəldi zəmaneyi-fərağ.
Şahidi-bağ mey içib pərdəni saldı çöhrədən,
Gül kitmi gəldi məclisə, aləmi etdi tərdimağ.
Vəsl zamanıdır, Zəfər, könlünü şadü xürrəm et,
Yar ilə özgə üz verir söhbəti-bağü kəştrağ.

* * *

Saqiya, düşdün xumarə, ver bizə altun ayağ
Kim, küdurətdən çıxıb meydən olalım tərdimağ.
Mütribü mey xoş bulur bir dilbəri-məhru ilən,
Bülbüli-şeyda kimi tutmaq vətən dər künci-bağ.
Bu cəhani-faniyə çox etmək olmaz etibar,
Bülbülün yerin alır qafil düşəndə zaği-mağ.
Nagəhan bir yel əsər, aləmni digərdun edər,

Bəzm ara tarik bulur bu yanan şəmü çırağ.
Ta Zəfər yar ikən eylə fikrini, ey mahru,
O gedəndən sonra qalmaz böylə arayişi-bağ.

* * *

Nəqdi-ömrüm olsun ol yarə tələf
Kim, vəfa üzrə ola yar xələf.
Vər nə çoxdur bu cəhanda dilrüba,
Zaye eylər eşq ara abü ələf.
Çövhəri-pak olanı bəslər əziz,
Can içində gecəvü gündüz sədəf.
Bir vəfasız yarə verdim könlümü,
Sinəm oldu tiri-müjganə hədəf.
Yüzinə zülfün pərişan eyləmiş
Kim, yaraşır məh yüzə mişkin kələf.
Ey Zəfər, saf eylə könül çeşməsin,
Şur edən dəryanı örtər mövci-kəf.

* * *

Başıma düşdü yenə sövdayi-eşq,
Könlüm oldu mənzilü məvayi-eşq.
Zahidin işi riyayidir müdam,
Dildə yoxdur bir nəfspərvayi-eşq.
Söylədigi budur ol kafər dilin,
Fitnə salır xəlq ara qovğayi-eşq.
Özünün rəyincə işlər işləri,
Şər′ ilən örtər rüxi-zibayi eşq.

Sufiyi-safi təriqin tut, könül,
Ver Səfi tək rəyini bir rəyi-eşq.
Ey Zəfər, dünyayə yoxdur etibar,
Cavidandır ta əbəd üqbayi-eşq.

* * *

Oldu rəngin qanlı yaşımdan mənim rəngi-şəfəq,
Nameyi-əmali yazmaqdan qaraldı min vərəq.
Eşqə düşdü cismi-zarım, olmadı qəmdən xilas,
Verməmdim öz işimə hicran əlindən bir nəsəq.
Tutmuşam üz dərgəhinə ol şəfaət kanının
Kim, işarə birlə etdi mahi-bədri iki şəq.
Mustafavü Mürtəza püştü pənahımdır mənim,
Məktəbi-eşq içrə aləmdir ona tifli-səbəq.
Qoyma əldən, ey Zəfər, övladi-pakin damənin,
Çün əzəl gündən belə tərtib tapmışdır nəsəq.

* * *

Əql əvvəldən yarandı ruhi-pak,
Sonra gəldi ərsəyə toquz səmak.
Dörd ünsür bir-birilən yar olub,
Oldu peyda yer yüzündə abü xak.
Pəs vühuşü teyrü cinn ilən pəri,
Axirin insanü əşcarat tak.

* * *

Zəfər, yarın üzün gördün, mübarək,
Könül halını bildirdin, mübarək.
Səhər xəndan gəlin derdin bağından,
Onu naz ilə güldürdün, mübarək.
Siyəh zülfün pərişan eyləyəndə,
Qəmin könlün sevindirdin, mübarək.
Tökərdin göz yaşın hicran əlindən,
Ümidi-vəslə sildirdin, mübarək.
Nihan yerdə görüb ol işvəsazı,
Səməndində mindirdin, mübarək.
Gecə bayram, gündüz oldu novruz,
Özünü yarə bildirdin, mübarək.

* * *

Tapdı ləzzət nemət içrə yardin kani-nəmək,
Bu səbəbdən yardır ləzzət ara kani-nəmək.
Bu nəsihətdir, könül, məndən sənə eşit sözüm,
Çün yedin yar ilə, pozma əhdü peymani-nəmək.
Yari-pürsuzla oturma, durmagil əğyar ilə,
Ta ki, vardır can bədəndə, can sənin cani-nəmək
Duz yeməkdə hər kişi kim, oldu xain göz tutar,
Öz işini işlər axır nərdə var nanü nəmək,
Şüfrə salgil öninə hər kim sənə oldu qonaq,
İzzətin tut ol kimin kim, oldu mehmani-nəmək,
Ey Zəfər, bu dəhri-dun kimsəyə etməz etibar,
Ol ki, qalır kimsəyə ehsandurur xani-nəmək.

* * *

Güllərin mətlubi bülbül, bülbülün mətlubi gül,
Meykeşin mətlubi saqi, saqinin mətlubi mül.
Şəmdən ötrü özün pərvanə yaxmış odlara,
Eşq babunda bu san təqsim qılmış əqli-kül.
Bülhəvəs buz cisminə pünhan olur od görgəcin
Kim, iraqdan dinləmək yaxşı olur bangi-dühül.
Ey nəsimi-sübh, gəl bizdən apar yarə pəyam,
Elçilik babında məhrəm sən təki olmaz rəsul.
Ey Zəfər, yarın həvasidir həyati-cavidan,
Yardan ayrı dirilmək aşiqə mümkün degül.

* * *

Ümid məzrəəsindən götürmüşəm hasil,
Özümi nist qılıb, yarə olmuşam vasil.
Həzar şükr ki, doğru yol üstədir səfərim,
Bu yoldan özgə əgər var, getmədim, batil.
Cünuni-eşq çıxardıbdır əqlimi başdan,
Və gər nə cahil ikən var idim bəsi aqil.
Hədisü ayeyi-Quran kimi rəfiqim var,
Bu söhbət ilə cəhan içrə olmuşam kahil.
Zəfərlə yar olub, Mürtəza Əli quluyam,
Göz açıban yumicək ondan olmadım qafil.

* * *

Can nəqdini fəda rəhi-cananə qılmışam,
Könlüm evini eşqlə viranə qılmışam.

Məcnundən artı şöhrəti-eşqim bu xəlq ara,
Fərzanəyəm ki, özümi divanə qılmışam.
Eşq odu düşdü başıma bir şəmi-bəzmdən,
Ol şəmi-bəzmə canımı pərvanə qılmışam.
Mənidə bütpərəst olur surət istəyən,
Mən tərki-surətü bütü bütxanə qılmışam.
Fərhad verdi can rəhi-eşqi-məcazdə,
Mən xatiri məcaz ilə biganə qılmışam.
Ta düşdi başə nəşeyi-cami-şərabi-eşq,
Göz sağərin bu nəşəyə peymanə qılmışam.
İzhar etmə hali-dilin xəlqə, ey Zəfər,
Çün cümlə ərzi-halini sultanə qılmışam.

* * *

Üç bəlalu kimsə olmuş həmdəmim,
Gah hicran, gah hirman, gəh məlal.
Gecə-gündüzdür ənisü məhrəmim,
Gah hicran, gah hirman, gəh məlal.

Deyə bilməm kimsəyə halim təmam,
Yari-bədxu bir dəm olmaz bizə ram,
Ağladırlar bu fəqiri sübhü şam,
Gah hicran, gah hirman, gəh məlal.

Saqiya, gəl dövrə salgil sağəri.
Şayəd ola könlmün rövşəngəri,
Qoymadılar bəzmimə sən dilbəri,
Gah hicran, gah hirman, gəh məlal.

Vəslə yetürgil məni, ey yüzi gül,
Əksük etmə bəzmimizdən camü mül,
Oda yaxdı, cismi-zarım oldu kül,
Gah hicran, gah hirman, gəh məlal.

Bir qulundur boynu bağlı bu Zəfər,
Dost kuyinə onu yetir bixətər,
Etdi işim günbəgün yövmül-betər,
Gah hicran, gah hirman, gəh məlal.

Verdi dövran cami-eşqi saqi tək,
Qaldı həsrət urəgimdə dağı tək,
Çevrəm almış gahü bigəh yağı tək,
Gah hicran, gah hirman, gəh məlal.

Olmuşam Məcnun təki yardan iraq,
Canıma kar eylədi suzi-fəraq,
Məni istəyibən edərlər soraq,
Gah hicran, gah hirman, gəh məlal.

* * *

Doğruluqdan yoxdur, ey dil, min məqam,
Saqiya, gül rəngin etgil bəzmi-cam.
Səg rəqibdən yetdi bizə çox sitəm,
Şükr kim, çəkdim qamudan intiqam.
Gərçi getdi əlimizdən izzü cah,
Şükr kim, qaldı yerində leyk qiyam.

Bəzm ara gəl dövrə salgil sağəri,
Keçdi dövran, gəldi indi dövri-cam.
Bu cəhan xəlqi düşübdür möhnətə,
Etdigi qandır dəmadəm, sübhü şam.
Püxtə tutgil işini, dövran keçər,
Etməz aqil öz işində fikri-xam.
Ey Zəfər, eyşi əlindən qoymağil,
Doğru söz budur ………………

* * *

Ey vəsl günü böylə olan fikrü xəyalım,
Gəl sor bu gecə hicrdə keçdi necə halım.
Var yarə xəbər ver ki, məni qəmdə buraxma,
Bir gün ölürəm, boynuvadır cümlə vəbalım.
Yandım bu gecə dana dəkin şəm oduna,
Pərvanə təki qalmadı təndə pərü balım.
Yolunda fəda etməgə canda həvəsim var,
Çox qalmadı bu yer yüzündə mülk ilə malım.
Gəl, könlümü qəmdən çıxar, ey dilbəri-qəmxar,
Məh yüzin edər qəm kuyidə dəfi-məlalım.
Sənsən gözümin nurivü sənsən mənə həmdəm,
Eşqin bilə tövəm törədi zövqi-vüsalım.
Hali-dilimi yazdı Zəfər, verdi səbayə,
Titrədi əlim, yazmağa qalmadı macalım.
İzhar sənə necə edim, ta biləsən sən,
Kuyindən iraq düşcəgi qalmadı halım.

* * *

Hicr əlindən ney kimi hər ləhzə nalan olmuşam,
Bülbüli-şeyda ilən həmrazi-əfğan olmuşam.
Yandı hicran oduna pərvanə tək balü pərim,
Şəmdən şəb ta səhərgəh zarü giryan olmuşam.
Şöhrəti-eşqim bu gün Məcnundan artı xəlq ara,
Kuhkən sözi kimi aləmdə dastan olmuşam.
Vamiqü Əzra əgər bu dəhr ara olsa idi,
Halımı görgəc bilirdi necə heyran olmuşam.
Gözlərimdən yaş yerinə qanlu su oldu rəvan,
Bəs ki, qəm kuyidə qalıb, didə giryan olmuşam.
Bu Zəfər halından etməz bərhəzər cövr eyləyən,
Yari-bədxu heç deməz toprağə yeksan olmuşam.

* * *

Can verib ta həmnişini-vəsli-canan olmuşam,
Paybəndi-riştə bər əhdü peyman olmuşam.
Ta nəfəs vardır tənimdə, tərk etməm eşqini,
Bir gəda ikən bihəmdüllah ki, sultan olmuşam.
Bulmuşam zövqi-vüsalın, qoymam əldən damənin.
Gərçi hicranın ilən dəstü giriban olmuşam.
Vermişəm can nəqdini ol mahi-bədrə runəma,
Xəlvəti-xassında ta bir gecə mehman olmuşam.
Bu səbəbdən yar olmuşdur mənə fəthü Zəfər,
Bir təni-bican idim, onu görüb can olmuşam.

* * *

Keçdi ömrüm, döndü dövran, munisimdir dərdü qəm,
Saqiya, gəl dövrə salgil, içəlim bir cami-Cəm.
Eşq odu kövdürüpdür bu təni-üryanımı,
Sərv qəddim bir hilal ay kimi tapdı piçü xəm.
Yar lütfün kəsdi məndən bu dönən dövran kimi,
Eşidib şad olmasın əğyar, vəchini deməm.
Dəşt ara Məcnun kimi tutmuşdum ülfət vühuş ilən,
Şimdi onlar həm məni görgəc eylərlər cümlə rəm.
Bilməzəm kim, bu fələkdəndir və ya dönmüş Zəfər,
Ya ədü tədbiridir, olsun cəhanda ömri kəm,

* * *

Halımı zar eylədi bir dilbəri-gülpirəhən,
Olmüşam bülbül kimi şeyda dər ətrafı-çəmən.
Özümü məşğul etdim hər zaman mən bir işə,
Vər nə Məcnun kimi baş alıb gedərəm ta Yəmən.
Vamiqü Əzra kimi oldum vətəndən dərbədər,
Gəzməmiş yer qalmadı dər tərəfi-ətlali-dümən.
Sərnəviştəm böylə olmuşmuydu ruzi-əzəl
Kim, yanam eşq atəşinə necə yandı Kuhkən.
Ah çəksəm, od salır ahım cəhanda bağ ara,
Nə qalır gülbərgi-tazə, nə qadır sərvi-səmən.

* * *

Nobahar oldu, yenə qəm götürüldü aradan,
Cümlə matəmzədələr çıxdı gög ilən qaradan,
Saqivü badəvü mütrib üçü həmraz olubən,

Gəldilər bizə məlayik kimi, bilməm haradan.
Onlar ilən belə bir şux pəri mahliqa,
Naz ilə suyə girib sünbüli-zülfün daradan.
Vermiş idi mənə bir vədə ki, yarın oluram,
Az yaratmış belə surət bizi heçdən yaradan.
Ey Zəfər, şükri-Xuda eylə ki, zərraqdürür,
Yetirir ruzini, bilməz kişi gəldi nərədən.

* * *

Könlümü eyləmədi cəm cü pərvin hicran,
Günbəgün eylədi bədtər məni qəmgin hicran.
Səbrimi aldı əlimdən, cigərim eylədi xun,
Bir nəfəs vermədi bu könlümə təmkin hicran.
Saldı bir kafərin eşqinə, çıxardı dindən,
Salik ikən elədi könlümü bidin hicran.
Vəsl ilən gərək idi könlümü ala şəbü ruz,
Zahirən bilməz imiş şivəvü ayin hicran.
Zəfər ilən eylədi dostluğu bir yanə,
Bilmədim nakəs imiş bidilü xain hicran.

* * *

Ey gözəl, mən tək o sərv qamətin xəm olmasın,
Xatirin qəm vəchdən bir ləhzə dərhəm olmasın.
Mən xəyalinlə bu qəmgin könlümü şad eylərəm,
Tək sənin könlündə bizdən bir nəfəs qəm olmasın.
İltimasım budur, ey iki gözümün mərdümi,
Mərdümi-biganə bəzmin içrə məhrəm olmasın.
Bir nöqtəylə məzrəmin mücrim olur gər baxsa kəc,

Bu Zəfər qulun sənin  dövründə mücrim olmasın.
Gər iraq düşdüm, həmişə könlümün içindəsən,
Ayağın tozu gözümdən bir nəfəs kəm olmasın.
Hər nəfəs həq dərgəhinə eylərəm dürlü niyaz,
Kim, rəqibim itlərinlə yarü həmdəm olmasın.
Bu Zəfər bir boynu bağlı quldurur, bilgil sənə,
Baxışın onun sarırya bir nəfəs kəm olmasın.

* * *

Ey könül, çün eşqə düşdün, keç bu dəhri-fanidən,
Algilən bir busə yarın püsteyi-xəndanidən.
Şeyb gəldi, baş ağardı, keçdi əyyani-şəbab,
İçməgil şərbət yerinə badə miskin qanidən.
Qanlı yaş tökməkdən oldu ruyi-zərdim laləzar,
Hicrə düşdün, bulmadın bir vəsl yari-canidən.
Qoyma əldən yar kuyində gədalıq şivəsin,
Müstəhəq keçər zəkat çün bəqayi-canidən.
Çəkmə can qeydin cahanda, padşahi-fəqr olan.
Təkyə vermə səltənət təxtinə, çıx zindanidən.
Məsiyətdir oldu səndən dəftəri-divan siyah,
Göz yaşıyla yugilən onu, könül, ünvanidən.
Ey Zəfər, çün kim, bəqayi-ömrə yoxdur etibar,
Əl götür bu dəhri-dunun dəftərü divanidən.

* * *

Riyadır zahidin feli, əyandır məkri halından,
Veribdir dini əldən, əl götürməz mülkü malından.

Yetim malını nuş eylər ki, yəni vəchi-əhsəndir,
Özünü xarü zar eylər, həzər qılmaz vəbalından.
Könül dünyayə sən uyma, onun tək dinini satma,
Riya elmində sahirdir, eşitmə qeylü qalından.
Rəhi-meyxanə tut daim, riyadən olgilən saim,
Həqiqət üzrədir qaim, xəbərdar ol vüsalından.

Bəzətmə özini cahil kimi dibavü atlasdan,
İgidlik keçdi, şimdi geygidən pakizə şalından.
Behiştdən gəldi üryan Adəmü Həvva bu dünyayə,
Libasi-alə aldanma, həzər qıl məkrü alından.
Gözəllər könlünü aldı əlindən neçə gün, bəsdir,
Gözün mərdümlərin mən′ eyləgil şol xəttü xalından.
Zəfər bulmaz cəhanda hər kişi əhli-riya oldu,
Olupdur peyrovi-şeytanü şərm etməz məalından.

* * *

Dün gecə düşdü gözüm bir dilbəri-məhparəyə,
Naz ilən girmiş idi suyə ki, zülfin tarəyə.[1]
Xali hindusin görüb oldu könül atəşpərəst,
Ondan ötrü mərdümi-çeşmüm giripdir qarəyə.
Məh yüzinə zülfi-mişkinin pərişan eylədi,
Qoydu mərhəm ləbləri könlümdə olan yarəyə.
Gözlərinin camidən məxmur idim, oldum xərab,
Rəhm qıldı, verdi bir sağər məni-biçarəyə.
Tazə güldür kim, nəzər bağında bulmuş pərvəriş,
Vermək olmaz ol güli, çün tazə gəlmiş arəyə.

[1] дарайа.

Gözdən axan yaşini bildi ki, mərdümzadədir,
Nisbəti yoxdur onun hər su gələn fəvvarəyə.
Yüzümə açdı, Zəfər, bağlı qapılar sübhdəm,
Eylədi ahım əsər ol dilbəri-xunxarəyə.

* * *

Saymadım hərgiz yəman mən yar ilə yoldaşıma,
Çərxi-gərdun zəhr qatıbdır rəvaru aşıma.
Yandırır hicrin oduna, bilməzəm vəchi nədir,
Bir sitəmkər dilbərin eşqini salmış başıma.
Qanlı yaş əz bəs ki, gözdən axdı, nuru qalmadı,
Rəhm qılmaz ol sitəmkər gözdən axan yaşıma.
Könlümin sirrini izhar etmədim heç kimsəyə,
İşimi saldım əzəldən nəqş edən nəqqaşıma.
Bəs ki, səbr etdim, cəfadən oldu evi xərab.
Ərzi-halım kimsə yoxdur ərz edə sirdaşıma.

* * *

Könlüm evidir sarayı Allah,
Vüsətli imiş fəzayi-Allah.
Heyran buna olmuşam ki, qeyrə,
Nədən edə dəxli-cayi-Allah.
Bu qarə könül ki, adıdır qəlb,
İblisə uyar becayi-Allah.
Ta var bu iki cəhan yerində
Eylər nəsəqin rizayi-Allah.
Bu cümlə ki, fani oldu mütləq,

Halında qalır bəqayi-Allah.
Məgər özi saxlayə evini,
Ayinə edə səfayi-Allah.
Hər kim ki, bu etiqad iləndir,
Əlbəttə görər liqayi-Allah.
Fəthü Zəfər ondan olmayınca,
Kimsə görməz liqayi-Allah.

* * *

Şükr kim, gəldi mənim yanıma yarım bu gecə,
Fələkə çıxmış idi naləvü zarım bu gecə.
Qalmamışdı dili-zarımda zəmani təmkin,
Yerinə gəldi yenə səbrü qərarım bu gecə.
Yaxmış idi tənimi atəşi-hicran danadən,
Vəsli-yar oldu halım, sordu nigarım bu gecə.
Şiddəti-qəm belimi əgmiş idi çü qəmü bim,
Rast oldu yenidən qaməti-zarım bu gecə.
Ey Zəfər, könlüm ara qalmadı bir çü-qəmi-bim.
Çünki düşdi əlimə çeşmi-xumarım bu gecə.

* * *

Ərzi-halım var könül sultanına,
Bir qulaq vergil gəda divanına.
Zahidin işi riyadır xəlq ara,
Əhdi yoxdur, baxmagil peymanına.
Zahiri mömindürür, qəlbi siyah,
Ülfəti var ruzü şəb şeytanına.
Aşiqin qanına ol fitva verir,

Girməgil sən sadiq aşiq qanına.
Batini yox, xəlq üçündür taəti,
Ta ki, aləm üz verə divanına.
Bu fəna dünya üçündür işkili,
Min bərabər büxli var ehsanına.
Axirət evində yoxdur bəhrəsi,
Qeyr malın xərc edər eyvanına.
Etiqad etməz ona bimari-eşq,
Ehtiyacı yox onun dərmanına.
Səyi budur gecə-gündüz aşiqin.
Kim, özüni yetirə cananına.
Bəndəyə Həq canibindəndir, Zəfər,
Uymuş ol nəfsi-ləin şeytanına.

* * *

Barilaha, səndən özgə sözümə yoxdur güvah,
Aşkaradır sənin dərgahına gizli günah.
Dudi-ahim qorxusundan baş çəkər gərdun sarı,
Bu düxanın tirəligindən tutuldu mehrü mah.
Lütfinə vardır ümidi kibrü tərsanın qəmu,
Gər günahə sən qalırsan, vardürür yüz min günah.
Gərçi piri-dilşikəstə olmuşam, tut əlimi,
Qılmagil nəfsi-sitəmkar əcrinə ömrüm təbah.
Yoxdur əndişəm ədudən, gər, Zəfər, yar iləsən,
Qəm sipahi qonali könlümə məsdud oldu rah.

* * *

Dilim iməs ki, deyəm la biqeyri-illəllah,
Ki, min bir adı da əsl adıdır—Həqqin Allah.
Gətirdi kətmi-ədəmdən bizi bu yer üzünə,
Rəsul göndəribən oldu bizə hadiyi-rah.
Sitrati-müstəqimin mənisi nədir bilgil,
Rəsuldan sora hadi Əli Vəliyyullah.
İmamü hadidürür on bir oğlı ol vəlinin,
Zəmani-Mehdiyədən ta çıxa biəmrullah.
İki gözü Zəfərin intizarda oldu səfid,
Dilində virdi budur: «La ilahə illallah».

* * *

Şəbabi-ömr keçdi, ey könül, gəl yarı tərk eylə,
Cünuni-eşq düşmüş başına, dildarı tərk eylə.
Ağartdı başını şeybin havası, qamət olmuş xəm,
Xəyali-çeşmi-məstü qəmzeyi-xunxarı tərk eylə.
Əcəl peyki yavuqlaşdı, oyan yuxudan, ey qafil,
Dimağindən həvayi-zülfi-ənbərbarı tərk eylə.
Əyibdir belini möhnət, düşübdür ayağə başın,
Əcəl yetdi, belindən rişteyi-zünnarı tərk eylə.
Yenibdir kim əcəl peymanəsin nuş eyləyə kamın,
Könüldən nəşeyi-ol dideyi-xummarı tərk eylə.
Yetişdi qulağə külbangi-rehbət dəhr bağından,
Gəl indi bu tamaşayi, güli-gülzari tərk eylə.
Zəfər, cahil degilsən, eşq sevdasın çıxar başdan,
Gəl imdi zülfdən belindəki zünnarı tərk eylə.

* * *

Bir gecə yar içib, məst olub gəldi bizə,
Götürüldü aradan qəm, iki üz düşdü üzə.
Razlar başı açıldı iki yüzdən danadən,
Şəhdü şəkkər qarışıldı o gecə gizli sözə.
Pərdə qalxdı aradan, məst gözünü süzubən,
Darayıb sünbüli-mişkinini tökdü gül üzə.
Söylədim, cüşi-sirişkim sənə yetirdi məni,
Necə kim, suyi-quşa yarə yetər üzə-üzə.
Söylədi, məndən iraq olmuş idin, ey miskin,
Nə rəviş bu fələki-dun səni yetirdi bizə.
Ey gözəl, olmagilən bülhəvəs ilən həmdəm,
Nə verübsən özüni toxmunu salan öküzə.

* * *

Rəhm edəməz mən təqsir çəkən ahlərə,
Cürmə bəxşiş yaraşır adil olan şahlərə.
Bəxşişi bəndəyə  nisbət degil ol sultanın,
Lütf şayəstə degil himməti kütahlərə.
Bu Zəfər badeyi-vəhdətdən olubdur sərməst,
İçirir şərbəti-məni dili agahlərə.

* * *

Barilaha, etməmişdim padşalıq arzu,
Şükr, məndən imdi eylər şəh gədalıq arzu.
Saldı odlar zöhdü təqva canına lütfün sənin,
Məni görən şimdi eylər parsalıq arzu.

Bildilər əhli-riya getdikləri yol əgridir,
Lütfünü görüb edərlər mübtəlalıq arzu.
Xanəgəh şeyxi oları görübən oldu zəlil,
Ta dəmi-məhşər dəxi etməz riyalıq arzu.
Bu Zəfər canın fəda qıldı sənə bu mənidə,
Kim, var idi könlü içrə canfədalıq arzu.

* * *

Açmadı üzimə bu dövri-fələk bir qapu,
Nə şikayət edəyim, xuyi budur, xüsləti bu.
Axdı seylabi-sirişkim şətt-Bağdad sarı,
Bəs ki, qəm kuyidə tökdü bu gözüm çeşməsi su.
Saqiyi-bəzm görüb halımı tutdu sağər,
Götürüldü aradan yari-kədu birlə səbu.
Ramazan ayı gəlib düşdü arayə neçə gün,
Oldu bu vəchilə meyxanə qapısı bağlu.
Fəthi-meyxanə üçün oxudum ayati-qədəh,
Ta Zəfər yar ola, açıla bu bağlı qapu.

* * *

## TƏRKİBBƏND

Mənəm ki, cümleyi-üşşaq ara bu gün ələməm,
Müqimi-dərgəhi-Sultan Səfiyi-pür kərəməm,
Əgərçi müflisəm, əmma fəqiri-möhtərəməm,
Yolunda verməyə can demə kimsədən ki, kəməm,
Əlimdə yox isə can nəqdi ilə möhtəşəməm.

Gözüm yaşı tökülən yerdə dürrü mərcandır,
Fəqir hədiyyəsi sultanə töhfeyi-candır.

Cəfayi-çərxi-fələkdən həmişə məmnunəm,
Əgər riayətin etsə qəminü məhzunəm,
Şikayət eyləsəm ondan, onun kimi dunəm,
Xəyali-Leyli ilən adı bəlli Məcnunəm,
Demə ki, cövrü cəfadən dəmi digərgunəm.

Apardı könlümü əldən o yar pünhani,
Qıya-qıya baxışı olmuş afəti-cani.

Mənəm dəva yerinə dərd qılmışam hasil,
Deməm ki, rəngü rüxi-zərd qılmışam hasil,
Könüldən ahü dəmi-sərd qılmışam hasil,
Rəqib gözlərinə gərd qılmışam hasil,
Kuyində it kimi şəbgərd qılmışam hasil.

Ki, gecə dana dəgin edə naləvü fəryad.
Nə qurtula o cəfadan, nə xod ola dilşad.

Hümayi-tarəmi-Qüdsəm könül həvasilən,
Əlaci-dərd edirəm xublar dəvasilən,
Təlaşə düşdi könül eşq macərasilən,
Bəlayə düşməmişəm özgələr rizasilən,
Xoşam həmişə siyəhzülflər bəlasilən.

Şükr ki, gərdişi-dövran mənim muradimcə,
Həqiqəti-əməlim hüsni-etiqadimcə.

Deyin əduyə mənim halimə nəzər qılsın,
Ədəb riayət edib ahdən həzər qılsın,
Olur dəmi ki, dua canına əsər qılsın,
Gəda kimi onu aləmdə dərbədər qılsın,
Rəvani it kimi tən mülkdən səfər qılsın.

Çəkər yəman kişidən çərx intiqami-zəman,
Öninə yaxşı gəlir yaxşının, yəmanə yəman.

Həqiqət əhli olan yerdə qeylü qal olmaz,
Zəmiri saf olanın könlündə məlal olmaz,
Günəş yüzündə şəhadətdən özgə xal olmaz,
Cəhanə feyz verir, özi paymal olmaz,
Pənahımızdır o kim, mülkinə zəval olmaz.

Həmişə ondan olur bəndəsinə fəthü Zəfər,
Yəqinü sidqin ilə bağla xidmətinə kəmər.

Onu ki, gül yaradıbdır, cəhanda etməz xar,
Həsud hiyləsi iqbalı eyləməz idbar,
Əgərçi afətü rahətdədir bu leylü nəhar,
Könlini qönçə tək açar nəsimi-fəsli-bahar,
Gətir piyaləni, sal gərdişə, gül yüzlü nigar.

Ki, hər kim oldu əzəldən cəhanda dövlətmənd,
Yetirə bilməz onun dövlətinə xəlq gəzənd.

Düşüşdü gərçi mənimlə bu çərxi-buqələmun,
Zəfər tapıb eylədi bəxt rayətini nigun,

Könül cəfayə dözüb vəz′in etdi digərgin,
Yenə vəfayə dönüb eylədi bəsi gərdun,
Budur həmişə onun işi, olmagil məhzun.

Müdam ol güli-rənanın içdügi qandır,
Vəli dun eylədügindən bu gün peşimandır.

Zəfər, Füzuli gemiş əhdinə vəfa qılgil,
Yetər şikayət edib şərhi-macəra qılgil,
Vücudini hədəfi-navəki-bəla qılgil,
Qəmu cəfalərinə səbr edib dua qılgil,
Niyazü əcz ilə dur ərzi-müddəa qılgil.

Ki, həqdir qəmunun cümlə işinə bani,
Zəmanə mülkinə aldanmagil, olur fani.

## MÜSƏDDƏS-TƏRKİB

Hər gün çəkdin isə dəhr ara yaxşı-yəman,
Ta əbəd etməyəcəkdir belə gərdiş bu cəhan,
Olmadı çərxi-fələk gərdişinə kimsə zəman,
Bədgüman olmagilən, səbr qıl, ey ruhi-rəvan,
Əlinə düşdü bu dəm daməni-bir rahəti-can,
Qalmadı tünd axan sudə səlamət bu kuzə.

Ey şəha, pir olub qalmadı göz evində nur,
Verdigin mujdə bizə oldu neçün vədəsi dur,
Yüzinə baxmanam ər[1] şimdi gələ yanıma hur,

[1] Яэяр.

Bəndədən nifrət edər bəzmim ara yari-qəyur,
Əyağım biri bu dünyadə, biridir ləbi-gur,
Vergilən nurini töxmini salan o gözə.

Ey könül, yar gəlib dərdinə qəmxar oldu,
Deməgil qəm əlidən könlümüz əfkar oldu,
Şükr kim, qəm yükü arxamda səbükbar oldu,
Dövlətin dönmüş ikən gəldi, Zəfər, yar oldu,
Düşmənin dəhr arasnıda qəmu xar oldu,
Xunfəşan olma dəxi, rəhm eyləgil iki gözə.

## MÜXƏMMƏS-TƏRKİB

Bülbüli-şeyda kimi oldum gülüstandin cüda,
Zarü nalan olmuşam gülbərgi-xəndandin cüda,
Ney könül açıldı qəmdən hurü rizvandin cüda,
Ney nəva saz eylədi bülbül gülüstandin cüda,
Tutiyəm, könlüm açılmış şəkkəristandin cüda.
Ta edibdir ayrı cami-vəsldən canan məni,
Təlxkam etdi bu dövran badəsindən can məni,
Hər nəfəsdə öldürür qəm zəhrdin hicran məni,
Müstəmənd etdi bu dürlü dərd ilən dövran məni,
Ol zəmandan ta ki, düşdüm vəsli-canandin cüda.

Bəsdürür, ey xari-hicran, canıma sancılmagil,
Dilbərin cövrinə qatlan, bivəfalıq qılmagil,
Ta nəfəs vardır bədəndə, kuydən ayrılmagil,
Ey könül, səbr eylə sən, həm qeyriyə meyl etməgil,
Deməgil dövri-fələk saldı mənim ondin cüda.

Ol qədər eşq atəşinə cismü canım yandılar,
Gecələr də şəmvəş pərvanələr oyandılar,
Sübh olanda mürdə şəm′i cümləsi kül sandılar,
Ondan ötrü yas tutubən külünə boyandılar,
Çərx etdi onları şəm′ü şəbistandin cüda.

Hər könül kim, qaldı tənha bir güli rüxsarsız,
Bülbülə bənzər ki, qalmışdır güli gülzarsız,
Qalmasın heç kim Zəfər tək bu cəhanda yarsız,
Bir yiyəsiz kimsə dönmüş, yarsız, dildarsız,
Olmasın, yarəb, zəmani bəndə sultandin cüda.

* * *

Hər kişi dünya evində oldu amil, ey könül,
Yoxdurur onun başında əqli-kamil, ey könül,
Bir nəfəs qəflət yuxusundan oyangil, ey könül,
Keçdi cahillik zamanı, olgil aqil, ey könül,
Bir nəsihətdir sənə məndən, eşitgil, ey könül.

Dövləti-dünyayə uymagil, sənə ol al edər,
Sahibi-cah eyləyəndə fikri-mülkü mal edər,
Səylər kim eyləmişdin, cümləsin pamal edər,
İki gün rahət verəndə salü məh bədhal edər,
Bolmagil divanəvü olgilən aqil, ey könül.
Bir güli-rənayə bənzər dövləti-dünyayi-dun,
Gəh qızarmaq, gəh saralmaq işləridir vajgun,
Ta ki, fürsət əldə vardır, olmagil ondan zəbun,

Aqibət salır başına fikri-sövdayi-cünun,
Özini zaye edər cəhlilə cahil, ey könül.

Damənin qoyma əlindən, saqi, bəzminin müdam,
Çıxarır qəmdən səni mey söhbətivü rəqsi-cam,
Öz əlinlən tutgilən işin, etməgilən fikri-xam,
Bu iki-üç dilbər ilən söhbət eylə sübhü şam,
Bunların söhbətidir insani-kamil, ey könül.

Ey Zəfər, xeyr əksük etmə müstəhəqdən bir zəman,
Yaxşıya yaxşı gəlir, yəmanlara qalır yəman.
Kimsəyə qılmaz vəfa bu gərdişi dövri zəman,
Hicr əlindən şimdi olmuşdur qədin misli-kəman,
Olmagil Həq dərgəhindən heç qafil, ey könül.

* * *

Bu cəhanda şami-qəmsiz işrət olmaz, ey könül,
Sübhi-eyşin istəmə bişami-firqət, ey könül,
Ayrı olmaz bir-birindən nurü zülmət, ey könül,
İşrət odu yanmadı bidudi-möhnət, ey könül,
Beh ki, vəsli içrə yanə şəm′i-ülfət, ey könül.

Bivəfadır bu qədimi deyr ara bu köhnə taq,
Kim ki, içdi vəsl camın artı onda iştiyaq,
Vəsl çün mümkün degildir, səkməgil dərdi-fəraq,
İçməyənə dərd verdi, içənə verdi fəraq,
Zinhar ol cahə sarı qılma rəğbət, ey könül.

Gər fələk döndü isə, cövri sənə oldu əyan,
Xəlq ilən amiziş etgil, eylə kim, abi-rəvan,
Ülfət ilə ta ki, külfət götürülsün az miyan,
Söz danışmaq babdə ol tutiyi-şirinzəban,
Əql ilən peyda olur əsbabi-dövlət, ey könül.
Mənsəbi-dünya həsədsiz olmaz, ey rövşənzəmir,
Fitnə etmək peşəsidir gözləməz bürnavü pir,
Əlli il çəkdim cəfasun, axırı qıldı əsir,
Bir ulu sultan ikən etdi məni zarü həqir,
Çöhrəsindən bəllidir asari-nikbət, ey könül.

Əlhəzər, bu çərxi-dunun hiyləsindən əlhəzər,
Cövrünə səbr eyləgil, ta olmasın yövmül-bətər,
Xoş məsəldir kim, səfərdən mənfəətlidir həzər,
Şükr edib otur yerində, qıl ibadət, ey Zəfər.
Qoyma əldən bir nəfəs damani-ülfət, ey könül.

## MÜSTƏZAD

Dövlət dedigin dudi-rizlət, qaçgilən ondan,
Onun şəcəri, meyvəsidir od ilə möhnət.
          Onun sarı baxma,
          Özün oda yaxma.
Gözəllərilən zülfi ayırır çənbəri-şeytan,
Bu yolda ki, varsan, səni ol cənnətə başlar.
          Sən boynuna taxma,
          Bu yolu buraxma.
Eşit sözümü, ey Zəfər, incitmə özünü,
Bir yarə könül vergilənü özgəyə baxma.

* * *

## QİTƏ

Yar ilən xəlvət bu gün nərd oynadım,
Davın apardım, mənə verməz geri.
Dedim, ey yar, dəğəltərlik neçün,
Söylədi can ver, əvəz algil geri.

* * *

Canımın nəqdini saçdım payinə,
Dedi utan, başına düşmüş qırov.
Söylədim hər şamın axır sübhü var,
Dedi kim, məlum olur vəqti-dirov.
Gördü kim, dilxəstə oldum, rəhm edib,
Bir geri verdi, dedi bəsdir brov.
Zarlıq çox eylədim, dedi, Zəfər,
Bir tərəf yonma tişə tək, ol kirov.
Fikrə saldı ol qırov sözi məni,
Bir dəxi məlum olur vəqti-dirov.

* * *

Vəchi-məaş üçün könül aralı fikr edər,
Bilməz ki, dəhri-faniyə biganəlik gərək.
Künci-qənaət ərçe irür padşahlıq,
Dünyadan əl götürməgə mərdanəlik gərək.
Divanədir o kim ki, edir ona etibar,

Miskin Zəfər kimi buna fərzanəlik gərək.

* * *

Fərhadı görün, nəqş eyləmiş surəti-Şirin,
Daş üstə rəqibə qılıb ol yarını izhar.
Dildar gərək gizli könül evdə daim,
Gün görsə əgər yüzini, aşiqlərədir ar.
Guya ki, cünun olmuş imiş hicr əlindən,
Yaxud var imiş eşq həqiqətdə giriftar.
Ta kim eləyə Xovrovi-bidini cəhanda,
Bədnamü xəcil, oda yana necə ki, küffar.

* * *

Bir gecə dilbər məni evində mehman eylədi,
Əl tutub mənimlə yengi əhdü peyman eylədi.
Bu gədanın könlünü alıb təxtı üstə verdi ca,
Özünə dünya üçün təxt üstə sultan eylədi.
İki başdan çünki oldu mətləbi-xahiş təmam,
Döndü məndən, işimi ah ilə əfğan eylədi.
Bir güli-rəna təki verdi könül hərcayiyə,
Xəlq ara, yəni ki, öz eybini pünhan eylədi.
İxtiyarım getdi əldən, ayağına sürdüm üz,
Tazə sultanı nədən özgayə dərban eylədi.
Ey könül, bu dəhri-dunun işkili budur müdam,
Sən buna aldanma kim, əhd ilə peyman eylədi.
Yaxşılıqdan yoxdur cəhanda yadigar,
Bəd edən dünya evin özinə zindan eylədi.

Ey Zəfər, eşit sözümi, bir nəsihətdir sənə,
Yar oldur kim, özün yarına qurban eylədi.

* * *

Sənsiz ey dilbər, bu gecə xatirim bitab idi,
Çəkdigim cam ləbaləb ta səhər xunab idi.
Bir nəfəs ta kim gəlib bəzm içrə onun cilvəgər,
Könlümün şəhrində qəm şəbgərdləri nayab idi.
Çünki getdin zülmət oldu gözümə ol bəzmi-xas,
Kim həyatın çeşməsi zülmət ara nayab idi.
Rişteyi-könlümdə yüz min üqdələr oldu pədid,
Belə bil kim, hər biri canımda min qüllab idi.
Bağrımın qanı sərasər oldu çeşmindin rəvan,
Çəkdigim mey, ey Zəfər, gözdən gələn xunab idi.

* * *

Ey könül, seyd eylədi bir gözləri ahu səni,
Can əvəz verdin alınca ləblərindən busəni.
Dün bənəfşə içində gördüm nihani seyr edir,
Nərgisi payinə salmış, lal etmiş susəni.
Ram etmiş özinə sənin kimi səyyadı ol,
Özinə qul eyləyə ol dilbəri-bədxu səni.
Yasəmənlər cümləsi batmış gögilən qarəyə,
Ta ki, ol əgninə geymiş bir qəbayi-susəni.
Ey Zəfər, bu göftgu Sultan Xətayi sözüdür,
Keçmə namərd köprüsündən, qoy aparsın su səni.

* * *

Könlümü aldı əlimdən bir nigari-xavəri,
Qamətidir sərvi-rəna, ləbləridir gülpəri.
Xali-hindusi məni atəşpərəst etdi bu gün,
Necə kim, hindu yanar oda, qalur xakistəri.
Bağ ara gər seyrə getsə ol nigari-mahvəş,
Şol çəməndə cümləsi bərbad olurlar gülpəri.
Ruzi-əvvəldən onun eşqi mənə olmuş nəsib,
Özgəsi kimi degildir eşqi onun sərsəri.
Bu Zəfər bir boynu bağlı quludur ol dilbərin,
Bəndəsinün bəndəsidir, çakərinin çakəri.

* * *

Gəldi bəzmim içrə qafil gülpəri,
Badə içmiş, məst olmuş gözləri.
Gün kimi açdı yüzündən çadırın,
Bağ ara bərbad oldu gülpəri.
Payinə düşdüm onun məhtab tək,
Könlümü aldı berəsmi-dilbəri.
Huşimi aldı könüldən naz ilən,
Dedi kim, eşqim degildir sərsəri.
Hicr oduna yanmayınca vəsl iməz
Kim, budur ayinü rəsmi-dilbəri.
Bülbüli-şeyda kimi çəkdim fəğan,
Düşdi gərdişdən bu çərxi-cənbəri.
Ol gecə vəslə irişdim danadan,
Rəhm edib qaldı yanımda ol pəri.

Sübh olcaq oldu gözümdən nihan,
Bilmədim ol adəm idi, ya pəri.
Məh yüzindən açdı mey bəzmi niqab,
Söylədi, miskin Zəfər, gəlgil bəri.
Çox səni yandırdıq hicran oduna,
Vəsldir əknun müyəssər həmsəri.

* * *

Vəh ki, dinim aldı əldən bir pərivəş kafəri,
Çapuki nuşin etdi rəna qədi qarətgəri.
Ruhpərvərdir Məsiha tək danışmaq babdə,
Məhvəşü laləüzarü sərvqəd, siminbəri.
Zülfi gözləri qara qılmaqda şami-qəm kimi,
Şami-qəm dəf′inə məh yüzi çıragi-ənvəri.
Ey könül, bir böylə rənanın giriftarı olan,
Xəlq gözündən nihan olmaq gərək misli-pəri.
Saqiya, rəhm et Zəfər babında kim, edir vida,
Bu cəhandan getməmişkən dövrə salgil sağəri.

* * *

Getdim həsrət, yar qədrim bilmədi,
Gözlərimdən qanlı yaşım silmədi.
Uydu rəqibin sözünə ruzü şəb,
Xahiş ilən üzimə bir gülmədi.
Bilməzəm kim, bu nə taledir mənim,
Heç münəccim saətini bilmədi.
Bir dəvasız dərdə düşdüm dəhr ara.
Kim, Məsiha çarəsini qılmədi.

Yaxşılıq qalır həmin bu dəhr ara,
Vər nə kimdir bu cəhandə ölmədi.
Sidq ilən tutdu Zəfər ol daməni,
Heç rəncü möhnəti əksilmədi.

* * *

Məh yüzə düşdü dün gecə gözüm nəzzarəsi,
Bildim ki, sə′d imiş rəhi-eşqin sitarəsi.
Dərdim əlacına daxi fikr etmə, ey təbib,
Bimari-eşqi-yar olanın yoxmu çarəsi.
Dəryayi-eşqə düşdü isə zövrəqi-bədən,
Şadam ki, bir qədəm yol onundur kənarəsi.
Bir kəz şikəstə könlümü asudə qılmadın,
Qorxdun əlin kəsə bu sınıq şişə parəsi.
Bilgil ki, eşqi-Vamiqü Əzra əbəs degil,
Düşənin caniva da  atəşi-eşqim şərarəsi.
Sanma ki, yar aşiqdin ayru sayıla,
Talibdən ayrı heç degil yarın arəsi.
Demə dəxi, Zəfər, bu qəmi-eşqə çarə yox,
Bir vəsli-yar ilə sağalır cümlə yarəsi.

* * *

Çün, səba, gül yüzinə düşdü gözüm nəzarəsi,
Bülbüli-şeyda kimi oldum gülün avarəsi.
Dərdi-eşqə düşdü könlüm, saqiya, gəl dövrə sal,
Badeyi-gülrəngmiş bu dərdi-eşqin çarəsi.
Düşəli yarımdan ayrı yuxu gəlməz gözümə,

Su yerinə qanlı yaş tökər gözüm fəvvarəsi.
Yar gəlmiş, bağ ara sərvi-xuraman tək gəzər,
Rəşkdən gül qönçə olmuşdur, görünməz narəsi.
Ey Zəfər, Məcnundan artı şöhrəti-eşqin sənin,
Bu səbəbdən mehr tək oldun vətən avarəsi.

* * *

Bildinmi, könül ki, yar gəldi,
Qış getdivü laləzar gəldi.
Bülbül oxur idi bu səbəqdə,
Kim fəsli-güli-bahar gəldi.
Quşlar tüləgə çəkdi əldən,
Fürsət gözədüb şikar gəldi.
Nərgis gülə müjdə verdi key yar,
Özün bizə gəl ki, zar gəldi.
Dövran bizə etdi yarlıq bəs,
Axırda beşəkli-mar gəldi.
Əgdi qədimi, hilalə döndüm,
Gözüm önümə qübar gəldi,
Gül kimi çəmən ara gəzərdim,
Döndü Zəfərü nizar gəldi.

* * *

Bir nəfəs dövri-fələkdən xatirim şad olmadı,
Qəm əlindən xəstə könlüm bir dəm azad olmadı.
Gah yaxdı hicr oduna, gah saldı dərbədər.
Könlüm evi bu zaman dövründə abad olmadı.
Gah işrət yerinə yetişdi tir ilən tüfəng,

Heç kimə mənim təki bu qism bidad olmadı.
Bilməzəm kim, mehrdir, ya qəhrdir, həq söylədiyin,
Bu sitəm kim, mənə oldu, hali-Fərhad olmadı.
Gərçi Məcnun düşdü eşqə Leyli ilən oldu vəsl,
Heç aşiq halinə bu qism bidad olmadı.
Ey Zəfər, şad ol ki, hər bir möhnətin yüz əcri var,
Kim ki, qəm çəkdi bu gün, olmaz ki, dilşad olmadı.

* * *

Ramazan ayidə bu nüsxə sərəncam oldu,
Əlfü fa keçmiş idi hicrdən itmam oldu.
Oxuyanlar məni bir yad edə yaxşılıq ilə,
Gərçi suzi-qəm evidə püxtə ilən xam oldu.
Yüzinə pərdə çəkib, eybini islah edibən,
Deməsinlər ki, qəmə düşdü, sözü xam oldu.
Bu fələk dövridürür, kimsəyə qalmaz cavid,
Ey xoş ol kimsə, bu gün nik sərəncam oldu.

* * *

Bəzm ara bir mahru zülfin pərişan eylədi,
Badə tökdi sağərə, bəzmi gülistan eylədi.
Xali-hindusin görüb oldu könül atəşpərəst,
Özini saldı oda həmraz ona can eylədi.
Mərdümi-çeşmim onu görgəc gözündən tökdü yaş,
Qanlı su birlə o bəzmi xoş Zərəfşan eylədi.

* * *

Canı canan diləmiş, la demədim can getdi,
La demək küfrdü, ol can ilə iman getdi.
Əhdü peymanı olan yarə nədir can vermək,
Nəqdi-can səhldir, əhd ilə peyman getdi.
Gismi-zarımnı yaxıb atəşi-hicrə danadan,
Vəsl su səpmədi bu odavü canan getdi.
Bir kəz yar olubən sormadı halım necəsən,
Bir gecə yol azıban gəldüvü mehman getdi.
Şövqdən ol gecə oldu gözümə yuxu həram,
Təxti qoydu iyəsiz, günilə sultan getdi.
Ayağım pür mey ikən saldı məni ayaqdən,
Canımı al ilə alıb məhi-taban getdi.
Zəfəri xak ilə yeksan elədi ol kafər,
Qüssə mundən çəkərəm, din ilə iman getdi.

* * *

Şükr kim, getmiş ikən yanıma canan gəldi,
Cismi-zarımğa rəvan can ilə şol can gəldi.
Yüzümi sürtdüm ayağinə, töküldü yaşım,
Sandı kim, sərvin ayağinə sudan can gəldi.
Külbeyi-tarımı məh yüzi ilən qıldı münir,
Gün qürub eylədivü şol məhi-taban gəldi.
Şəkərin ləbləridin kamını aldun danadan,
Könlümü almaq üçün həmdəmü canan gəldi,
Şükr kim, açdı qapı yüzimizə fəthü Zəfər,
Təxt üstinə bu gün yengi Süleyman gəldi.